İngilis dili dünyanın aparıcı xarici dili olduğu və əksər ölkələrdə ikinci dil kimi işləndiyi üçün, təbii olaraq, ən çox bu dil tərcümə prosesinə məruz qalır və nəticə etibarilə, ingilis dilini öyrənmə və mənimsəmə səviyyəsi bu tərcümələr sayəsində günü-gündən artır. Mətbuatın tərcüməsi isə nisbətən mürəkkəb bir məsələdir, çünki funksional dil üslubları arasında mətbuatın dili olan publisistik üslub qədər intensiv dəyişikliyə məruz qalan yoxdur. Publisistik üslub xalqın dilidir, xalqın anlaması üçün dizayn və korrektə edilir, burada əksər hallarda mürəkkəb elmi terminlər, qəliz metaforalar işlənmir və dolayısılə, mahiyyət etibarilə məişət üslubuna da ən yaxın olan üslub publisistik üslubdur. İngilisdilli mətbuatın tərcümə xüsusiyyətlərinə nəzər yetirərkən də bunu nəzərə almaq lazımdır: inkişaf etmiş ölkələrdə çap olunan qəzetlər, əksər hallarda, həmin ölkənin vətəndaşlarına ünvanlanır və konkret adresat bəllidir, odur ki, bu qəzetlərdə tez-tez milli ideologizmlər, neologizmlər, arxaizmlər, həmin xalq üçün xarakterik olan frazeoloji birləşmələr və s. tez-tez işlənir ki, bu dil tərkibləri də tərcümə prosesini müəyyən dərəcədə çətinləşdirir və tərcümənin təbiiliyinə kölgə salır. Məlumdur ki, dilin leksik vahidlərini əksər dillərə qarşılıqlı şəkildə tərcümə etmək olar, lakin elə sözlər, birləşmələr və ya ifadələr vardır ki, konkret olaraq bir xalqın tarixinə, yaşayış və məişət tərzinə müvafiq olaraq yaranmışdır və onların əcnəbi dillərə tərcüməsi çətindir.

Mətbuatın dili elmi mətnlərdən tamamilə fərqlənir. İstər ingilisdilli, istər başqa mətbuat olsun, qəzet səhifələrini oxuyarkən biz çoxlu sayda siyasi, sosial tərkibli sözlərlə, neologizmlərlə, yer adları ilə, şəxs adları ilə və s. daha çox rastlaşırıq. Müəllif jurnalistikasında, məlum olduğu kimi, eyham və sitatlı mətnlərin üstünlük təşkil etməsi xarakterikdir. Lakin qəzetlərdə sadəcə müəllif jurnalistikası metodundan istifadə olunmur, burada hiperbola, metafora (geniş və "donmuş"), müqayisəli analiz, metonimiya, alleqoriya, efemizm və s. də geniş şəkildə istifadə olunur.

Qəzet dilində oxunaqlılığı artırmaq və oxu sürətini yüksəltmək üçün bəzən "qəzet klişeləri" deyilən məfhumlardan da istifadə olunur. "Klişe" sözü burada ilkin olaraq ağla gələn anlamda, yəni "bayağılıq və təkrarçılıq" anlamında deyildir, daha çox, qəzetlərdə tez-tez müraciət olunan fərdi-korporativ üslubları nəzərdə tutur. Hər bir qəzetin (və xırda rubrikaların) müəyyən oxucu kütləsi və ya auditoriyası olur ki, həmin qəzetdəki mətnlərin adresatı məhz onlardır, dolayısılə, bu mətnlərin yazılması zamanı özünəməxsus ifadələrin işlənməsi, daimi oxucuya tanış olan hansısa eyhamlardan istifadə edilməsi, məqalənin ardıcıllığının oxucunun alışdığı şəkildə davam etməsi və s. tamamilə təbiidir və bu, artıq qəzet dilinin də spesifikləşməsi, hansısa konkret bir auditoriyaya yönəlməsi deməkdir. Bunu sadəcə qəzetlərə şamil etmək mümkün deyildir. Dünyanın nüfuzlu jurnallarının əksərinin hansısa məqaləsinin elə ilk cümləsini oxumaq belə bəzi diqqətli və daimi oxucular üçün yetərlidir ki, onlar bu məqalənin hansı jurnaldan olduğunu qət etsinlər. *"Time", "People", "National Geographic Magazine", "Foreign Policy"* və s. kimi nüfuzlu jurnalların konkret bir yazı üslub və stili vardır ki, bu, onları digər kompetitorlardan açıq şəkildə fərqləndirir və bu məxsusi üslub sayəsində daimi oxucu mətnin mənbəyin dərhal ayırd edə bilir.

İngilisdilli mətbuatda işlənən bir çox ifadələr ümumişləkdir və əksər auditoriyalar üçün anlaşıqlı klişelərdir, məsələn, "hard-liner" – mühafizəkar, "nuclear tension" – nüvə təhlükəsizliyi ilə əlaqədar məsələlər, "think-tank" – təfəkkür metodu və s. Bu klişeləri bilmək hər bir tərcüməçinin işini asanlaşdırır və mətni daha anlaşıqlı edir.

Qəzet klişelərini yaxşı bilmək mətni hərfi tərcümə edərək onun bütün ruhununun və məğzinin itirilməsini də önləyir. Yaxın illərə qədər Azərbaycandilli mətbuatda məhz hərfi və məzmunsuz tərcümələrin üstün olması olduqca təəssüfləndirici hal idi ki, son illərdə artıq əks tendensiya müşahidə olunur, bu da günü-gündən ingilis dili biliklərinin artması ilə əlaqədardır. Bundan əlavə, mətbuat dilində tez-tez rast gəldiyimiz söz yaradıcılığı prosesi də ingilisdilli mətbuatda daha çox fəaldır. Müqayisə üçün deyək ki, Azərbaycan dili kimi iltisaqi dillərdə qəzetlərdə tez-tez yeni milli sözə rast gəlmək mümkün deyildir və söz yaradıcılığı daha uzun, mürəkkəb bir prosesdir, ingilis dili isə flektiv dildir və sahib olduğu elastiklik sayəsində milli neologizmlərin sayına görə də liderdir. İstər ingilis, istər amerikan mətbuatı olsun, yeni söz formasiyalarına daim rast gəlmək mümkündür. Məsələn, ingilisdilli mətbuatda "*peace*" və "*keep*" sözlərini birləşdirərək "asayişi qoruyan" anlamında olan və polisi nəzərdə tutan "*peacekeeper*" sözü tez-tez işlənir. Bu mürəkkəb sözlərdən əlavə, söz və sözönülərin birləşməsi ilə yaranan və tire ilə yazılan mürəkkəb sözlər də vardır: "*sit*" və "*in*" sözlərinin birləşməsindən yaranan "*sit-in*" sözü "etiraz etmək (siyasi anlamda)" deməkdir, "*stay-in*" – yürüş keçirtmək, "*switch-over*" – dəyişikliyə getmək və s. [4.s.102].

Konversiya metodu ilə söz yaradıcılığı da ingilisdilli mətbuat üçün olduqca xarakterikdir. Dünyada baş verən mühüm sosio-iqtisadi və siyasi hadisələrdən bəhs edərkən işlədilən "hit" feili (vurmaq, zərbə endirmək, məruz qalmaq və s.) eyni zamanda "partlayış edən", "məşhurlaşan", "gündəmdə olan" mənasında "hit" isminə də çevrilmişdir. Qeyri-rəsmi şəkildə Azərbaycan dilində də işlənən "xit" sözü əsasən ən sevilən və gündəmdə olan mahnıları ifadə etmək üçün istifadə olunur. Şəkilçilər vasitəsilə yeni söz yaratmaq da ingilisdilli mətbuatda tez-tez baş verir. Məsələn, ən çox işlənən və yeni söz yaradan şəkilçilər (suffikslər)

olan "*–ize", "-dom", "-ship"* və s. o vaxtadək ağla gəlməyən sözlərə qoşulur və nəticədə yeni sözlər yaradılır: "*minimize*" – minimalizə etmək, "*leonize*" – kosmosa getmək, yer orbitindən çıxmaq, "*brinkmanship*" – hərbi balans yaratmaq və s. Bəzi alınma sözlər mətbuatda işlənməsi sayəsində daha da populyarlaşır: fransızca "dövlət çevrilişi" anlamına gələn "coup d'etat" artıq hamıya tanış bir "media termini"dir [5.s.88].

İngilisdilli mətbuatda qəzet başlıqları da tərcümə edilərkən xüsusi diqqət yetirilən sahədir. Azərbaycandilli mətbuatda olduğu kimi, ingilisdilli mətbuatda da qəzet başlıq, altbaşlıq və manşetləri, əsasən, söz birləşmələri, söz-cümlələr və sadəcə sözlərlə ifadə olunur, mürəkkəb cümlələr az işlənir. Azərbaycan dilində cümlədəki feilin zamanını dəyişmək və ya məsdərdə ifadə etməklə eyni mənanı çatdırmaq mümkün deyil, lakin ingilisdilli mətbuatda ən çox müraciət olunan başlıq forması da məhz belədir. Nümunə: "*Turkey Says Sabotage Impossible in Car Accident*" – bu başlıqda, göründüyü kimi, "to be" feili ixtisar edilmiş, fikir tamamilə yığcam çatdırılması üçün cümlə, belə demək mümkündürsə, "dondurulmuş"dur. Peşəkar tərcüməçi və oxucu üçün bunu anlamaq elə də çətin deyil: "*Türkiyə baş verən maşın qəzasında sabotaj ehtimalını istisna edir*". Bu, "to be" feilinin ixtisara məruz qaldığı tək hal deyil; amerikan mətbuatında da tez-tez bu cür başlıqlarla rastlaşmaq mümkündür: "*Ten killed in Iraq During Night Attack*" – "*İraqda gecə baş verən hücumda 10 nəfər həyatını itirdi*", "*UN meetings much "colder" than ever*" –"*BMT-nin yığıncağında "soyuqluq" müşahidə olundu*", "*The cure for cancer closer than never before*" – "*Xərçəngin müalicəsi artıq daha realdır*" və s.

İngilisdilli mətbuatda məchul növdə işlənən feillə digər feilləri ayırd etmək bəzən çətin olur. Sözügedən "lakoniklik" və "yığcamlıq" səbəbindən, məchul növün xarakterik xüsusiyyəti olan "to be" feili mətbuat mətnlərində yenə ixtisar edilir və cümlənin məlum və ya məchul növdə olduğunu anlamaq üçün mətnin mənasına, məğzinə varmaq lazım gəlir: "*A ceasifire agreement signed in conflict region*" – burada "*signed*" sözü "imzalandı" kimi tərcümə olunmalıdır və onu düzgün tərcümə etmək peşəkar tərcüməçinin öhdəsinə düşür: "*Münaqişə zonasında atəşkəs sazişi imzalandı*". Digər bir misal: "*Five more corps found in valley*" – "*Vadidə daha beş nəfərin cəsədi aşkarlandı*".

Günümüzdə tez-tez işlənən abbriveraturaların da mənşəyi mətbuatdır. İngilisdilli mətbuatda aparıcı tendensiya olan söz yaradıcılığı abbriveturalarda da özünü göstərir və mütəmadi şəkildə yeni ixtisarlar yaradılır. Bu, çap sahəsini qısaltmaqdan əlavə, həm də fikri daha sürətli çatdırmaq məqsədi güdür. "Prime Minister" əvəzinə "PM", "World Health Organization" əvəzinə "WHO", "Central Intelligence Agency" əvəzinə "CIA", "Iraq-Sham Islamic State" əvəzinə "ISIS" və s. Qəzet başlıqlarında (həmçinin, mətn daxilində) həmçinin obrazlı və ifadəli cümlələrə də tez-tez rast gəlmək mümkündür və bu, fikri yığcam ifadə etmək üçün yox, onu daha "obrazlı" və "təsirli" etmək üçün tətbiq olunur. Tərcüməçi üçün əsas çətinlik törədən mətnlər də məhz belə mətnlərdir, bu cür obrazlı ifadələrin tərcüməsi zamanı hərfi və ya ilkin başa düşülən tərcümə yolverilməzdir, mətn məna yükünə görə tərcümə edilməlidir. Məsələn: "*Catalons Get Nothing But Pain*" – göründüyü kimi, mətni düşünmədən, sadəcə sözlərə diqqət yetirərək tərcümə etdikdə məna itir və "*Katalonlar ağrıdan başqa heç nə almır*" kimi mənasız bir cümlə alınır, bu cür başlıqların tərcüməsi zamanı tərcüməçi öz təxəyyül və abstrakt təfəkküründən istifadə etməli, bəzi dəyişikliklər edərək mətni tərcümə olunan dilə uyğunlaşdırmalı və mənanın saxlanmasına xüsusi diqqət yetirməlidir. Yuxarıda qeyd olunan başlığı müvəffəqiyyətli bir tərcüməçi Azərbaycan dilinə bu cür tərcümə edərdi: "*Katalonlar yenə də kədərlə üz-üzədir*", yaxud "*Katalonların həzin məyusluğu*".

Yuxarıda qeyd olunan "qeyri-ənənəvi" tərcümə prosesi zamanı tərcüməçi həddən artıq sərbəstliyə də yol verməməli və öz abstrakt təfəkkürünü üstün tutaraq mətni özü istədiyi kimi formasiya və ya təhrif etməməlidir. Bu tərcümə prosesi zamanı ikiqat həssaslıq və diqqət tələb olunur, yanlış tərcümə informasiyanın da təhrif olunması deməkdir və nəticələri çox pis ola bilər. Digər bir nümunə: "*The Azerbaijanis' Shocking Genocide Turning the Picture Over*" – bu başlıqda əsas feil "gerund" forması ilə ifadə olunmuşdur ki, Azərbaycan dilinə tərcümə zamanı sadə feil zamanlarından biri şəklində çevriləcəkdir. Göründüyü kimi, hərfi tərcümə zamanı "Azərbaycanlıların şok soyqırımı şəkli tərsinə çevirir" şəklində mənası aydın olmayan bir ifadə alınır, halbuki, mətnin məğzinə varan və söhbətin nədən getdiyini bilən tərcüməçi bu başlığı belə tərcümə etməlidir: "*Azərbaycanlıların dəhşətli soyqırımı indiyə kimi məlum olan "faktları" yenidən sual qarşısında qoyur*" və ya "*Azərbaycanlıların dəhşətli soyqırımı ilə bağlı yeni faktlar ortaya çıxdı*". "Turning the picture over" – indiyə qədər bilinən gerçəklərin yenidən müzakirəyə çıxarılması və təkrarən sorğulanması deməkdir, qaba şəkildə deyilsə, "şəklə yenidən nəzər yetirmək" və ya "detalları aşkara çıxarmaq". Bu cür fraza və idiomları mükəmməl şəkildə bilməli olan tərcüməçi mətnin ümumi ruhuna xələl gətirmədən, onun orijinal üslub və stilini qoruyaraq, eyni zamanda, çatdırmaq istədiyi informasiyanı da dolğun şəkildə ehtiva edərək tərcümə etməlidir.

**Ədəbiyyat**

1. Humanitar elmlərin öyrənilməsinin aktual problemləri. Ali məktəblərarası elmi məqalələr məcmuəsi. № 4/2011 – Bakı, Mürtəcim, 2011 – 320 s.
2. Mazanlı İ.A. Jurnalistika və müasir dövrün qlobal problemləri: Dərs vəsaiti. – Bakı: "Bakı Universiteti" nəşriyyatı, 2013. 416 səh.
3. Bagnall Nicholas. "Newspaper language". Oxford: Focal press, 1993
4. Bruce D.Itule & Douglas A.Anderson. "News Writing and Reporting for Today's Media" – America: McGraw-Hil – Humanities/social sciences/languages-2002;
5. Newmark Peter. "About translation". Clevedon: Multilingual Matters Ltd.51-
6. Bengelsdorf Peter. "Idioms in the News – 1000 phrases, real examples" – 2013 (amazon.com)
7. Xin Xiong. "Press Translation in International Communication". Theory and Practice in Language Studies, Vol. 4, No. 10, pp. 2151-2156, October 2014
8. https://timesofindia.indiatimes.com/world/uk/idiocracy-among-1400-new-words-in-oxforddictionary/articleshow/66121171.cms
9. https://www.theguardian.com/commentisfree/2018/oct/12/princess-eugenie-cut-perks-monarchy-magic

**Rəyçi: dos. V.Babayeva**

Göndərilib: 29.07.2020 Qəbul edilib: 31.07.2020

DOI: 10.36719/2663-4619/56/40-46

**Xəyalə Muğamat qızı Mürsəliyeva**
Sumqayıt Dövlət Universiteti
Azərbaycan dili və onun tədrisi metodikası kafedrası
murseliyeva.xeyale@mail.ru

# SÜNİ DİLLƏRİN TƏRTİBİ PRİNSİPLƏRİ

**Xülasə**

İnformasiya partlayışı, beynəlxalq dillərin sayının daim artması müasir dil vəziyyətini olduqca çətinləşdirir. Dillərin qarşılıqlı təsiri son nəticədə dünya dilləri ilə paralel fəaliyyət göstərən beynəlxalq süni dillərin yaranmasına səbəb olur. İnterlinqvistik məsələlərin genişlənməsi müasir dünyanın dil mənzərəsinin ağırlaşmasının təbii nəticəsidir. Ünsiyyət vasitəsi olaraq beynəlxalq dilləri və beynəlxalq dilləri öyrənən dilçiliyin bir sahəsi kimi müəyyənləşdirilən müasir interlinqvistika dilarası baryeri aşmağın vacibliyi ilə məşğul olur. Beynəlxalq süni dil problemi İ.A. Boduen de Kurtene, V.P. Qriqorev, N.L. Qudskov, E.K. Drezen, A.D. Dulçenko, M.İ. İsayev, S.N. Kuzneçov, A.S.Melnikov və bir çox digər alimlərin yazılarında geniş şəkildə işıqlandırılmışdır.

***Açar sözlər:*** *təbii dil anlayışı, süni dil anlayışı, dilin sünilik dərəcələri, dilin həqiqiliyi*

## Principles of compiling artificial languages

**Summary**

The explosion of information and the ever-increasing number of international languages make the modern language situation very difficult. The interaction of languages ultimately leads to the creation of international artificial languages that operate in parallel with the world`s languages. The expansion of interlinguistic issues is a natural consequence of the aggravation of the linguistic landscape of the modern world. The modern interlinguistic dialect, which is defined as a field of linguistics that studies international languages and international languages as a means of communication, deals with the importance of overcoming the barrier.The problem of international artificial languages is widely covered in the writings of I.A.Baudouin de Courtenay, V.P.Qrigorev, N.L.Gudskov, E.K.Drezen, A.D.Dulchenko, M.I.Isayev, S.N.Kuznechov, A.D.Melnikov and many other scientists.

***Key words:*** *the concept of natural language, the concept of artificial language, the degree of artificiality of language, the authenticity of language*

### Giriş

Çoxdillilik insanlara ta qədimdən lənət kimi görünürdü. Babil qülləsi ilə əlaqəli İncil əfsanəsində məlumat verilir ki, insanlar cənnətə qüllə tikməyə cəsarət etdikdə, Tanrı qüllənin tikintisində iştirak edən insanların dillərini qarma-qarışıq bir hala salır və insanlar bir-birlərini başa düşmürlər. Beləcə insanların planları pozulur. Bundan sonra yarımçıq qüllə və planlanan şəhər həmin insanlar tərəfindən tərk edilir. Günümüzdə də "Babil qülləsi" deyildikdə çox zaman tamamlanmamış işlər, uğursuzluğa məruz qalan işlər və planlar başa düşülür. İnsanlar bu lənətin qaldırılacağını, bir-birlərini yenidən anlayacaqları vaxtı xəyal edirdi və bu məqsədlə, qədim farslar, yunanlar, romalılar, şərq və qərbin orta əsr alimləri insanları universal bir dil anlayışına qaytarmaq fikri əsasında birləşirlər.

İlk dəfə süni dil anlayışı ilə bağlı araşdırma cəhdi Lui Kutyura və Leopold Lo tərəfindən edilib. Onlar bütün təsnifatları əhatə edəcək 38 sistem nümayiş etdirmiş və vahid köməkçi beynəlxalq dil məsələlərini həll etmək, dünya elm akademiyaları ittifaqını cəlb etmək məqsədi ilə qurum təsis etmişlər.

Vahid ümumdünya dili- beynəlxalq dil termini aşağıdakı şəkildə izah edilir:

1. Beynəlxalq ünsiyyət vasitəsi kimi təklif olunan süni köməkçi dil;
2. Dünyanın xeyli ölkələrinin xalqları tərəfindən beynəlxalq ünsiyyət vasitəsi kimi istifadə edilən təbii dil;
3. Geniş miqyasda siyasi-ərazi birlikləri nümayəndələri arasında ünsiyyət üçün vasitə kimi təklif olunmuş sosial-dil qurumu (İzahli tərcüməşünasliq terminləri lüğəti, 2010: 11).

Qeyd edək ki, interlinqvistika tarixində ümumdünya dilinin əsası haqqında iki fikir mövcuddur:

1. Ümumdünya dilinin milli (təbii) dillər əsasında yaranacağı;
2. Ümumdünya dilinin süni dillər əsasında yaranacağı.

Məlumdur ki, insanlar minlərlə dildə danışırlar. Təbii dillərin bolluğuna baxmayaraq (və paradoksal olaraq bu bolluğa görə) demək olar ki, min ildir insanlar tərəfindən süni dil layihələri yaradılır. Bəs "təbii dil" və "süni dil" nədir? Bunu aydınlaşdırmaq üçün əvvəlcə insanın, insan cəmiyyətinin həyatında və işində

"təbii" və "süni" anlayışlarının nə olduğuna fikir verməliyik. Qeyd edək ki, bəşər cəmiyyəti yarandığı ilk gündən təbii dillər zaman-zaman yaranmış, bir hissəsi işləkliyini itirmiş, böyük bir qismi isə müəyyən dəyişikliklərlə bugünədək qorunub saxlanılmışdır. Dil hər bir xalqın mənəvi sərvətidir. Azərbaycan dilinin izahlı lüğətində "təbii" sözü "həqiqi, əsl, natural (süni əksi)" mənasını ifadə edir (Azərbaycan dilinin izahlı lüğəti, 2006: 283).

Həmin lüğətdə süni sözünün mənası isə belə göstərilir: 1. Təbii deyil, insan əli ilə düzəldilmiş, əslində olduğu kimi düzəldilmiş; 2. Saxta, uydurma, qeyri-səmimi. (Azərbaycan dilinin izahlı lüğəti, 2006: 170).

Dilçilik tarixində süni dil və təbii dil terminlərinə münasibət heç zaman birmənalı olmamışdır. Bu baxımdan dilçilərin fikirlərini aşağıdakı şəkildə qruplaşdırmaq olar:

1. Süni dil terminini inkar edərək, yalnız təbii dil termininə önəm verənlər;
2. Süni dil termininə önəm verərərək, süni dil layihəsi hazırlamağa çalışanlar;
3. Bu anlayışlar arasında sərhəd qoymayanlar: hər şeydə bir az süni, bir az təbii olduğunu əsaslandıranlar.

E. Sepir, G.Meyer, K.Bruqman, A.Leskin süni dil termini yaratmağın əleyhdarları olmuşlar. E.Sepir II Beynəlxalq Dilçilər Qurultayında süni dillər termininə etiraz etmişdir: "Süni termini, praktikada istifadə olunan bu cür qurulmuş dillər üçün nə psixoloji, nə də tarixi əsaslandırmaya malikdir" (Foster,1921: 87).

Boduen de Kurtene, A.A.Şaxmatov, N.Y.Marr və bir çoxları isə "süni dil" termininə xüsusi önəm vermişlər. N.Y.Marr yazır: Dünyada natural dil yoxdur, bütün dillər sünidir, hamısı insanlıq tərəfindən yaradılmışdır" (АН СССР, 1936: 35).

Marrın irəli sürdüyü bu fikir həqiqəti əks etdirir. Nəzərə alsaq ki, dil ünsiyyət vasitəsidir və bu ünsiyyət bacarığı insanda ən ali səviyyədə inkişaf edib, onda bütün dillərin də insan zəkasının nəticəsi olduğunu dana bilmərik. Dilimizin lüğət tərkibi daima inkişaf edir və onda, hər zaman az-çox dəyişikliklər nəzərə çarpır. Bu dəyişikliklər də insan zəkasının nəticəsidir, süni şəkildə aparılır. Lakin bu kimi dəyişikliklər bizə təbii və süni dilləri eyniləşdirməyə əsas vermir. Süni dil bir və ya bir neçə şəxsin təxəyyülünün məhsuludur: bu dil ya hazır dil materiallarından istifadə edilməklə tərtib edilir (esperanto, ido, volapük və s.), ya da qondarma şəkildə yaradılır (elven dilləri).

Rəssam, musiqiçi, mühəndis, riyaziyyatçı öz həmkarı ilə ana dilini bilmədən də ünsiyyət qura, bir-birlərini başa düşə bilərlər, bu söz dilinin başqa mənasıdır. Dil ünsiyyəti isə bütün bəşəriyyəti əhatə edir.

1. İlk görkəmli marksistlərdən olan Pol Lafarque (1842-1911) fransız aristokratiyasının dilini – adi insanların dilindən fərqli olaraq – süni hesab edirdi (Zamenhof, 1887:30). Akademik A. A. Şahmatov dildə hər hansı bir normallaşdırmanı süni adlandırırdı. Boduen de Kurtene yazır: "Demək olar ki, həmişə ədəbi dil süni şəkildə yaranmışdır" (Бодуэн де Куртенэ, 1904: 42). Prof. L. A. Bulaxovski (Булаховский,1950:8) də eyni fikirdə idi: "Qeyri-ədəbi dillər yoxdur ...".

Materialistlərin nöqteyi-nəzərindən bu anlayışlar arasında heç bir qanuna zidd və sərt sərhəd yoxdur. Axı, "süni şəkildə" edilən hər şey, canlı və canlı olmayan təbiətin tabe olduğu eyni riyaziyyat, fizika, kimya və digər elmlərin eyni qanunları əsasında təbiətdə olan materialdan hazırlanmışdır.

Tarixi inkişaf zamanı insan əvvəllər ona təbiətin çətinliklə bəxş etdiyi bir çox şeyi etməyi öyrəndi: süni lif, süni ipək, süni yun, süni xəz, süni kauçuk və s. Bu məhsullar təbiilik baxımdan daha yaxşı, daha gözəl və daha davamlıdır. Lakin sintetik materiallar - plastik - istehsalda və gündəlik həyatda, yəni bütün insan fəaliyyətində getdikcə daha böyük rol oynayır.

Əslində, Hüqo Şuxardtın da qeyd etdiyi kimi, dilçilikdə təbii adlanan proseslər və süni adlanan proseslər arasında əsaslı fərq yoxdur, belə ki, süni dillər az-çox təbii, təbii dillər isə az-çox sünidir.

Yazılarından birində prof. B. M. Kedrov qeyd edir ki, "təbii və anlaşılan" anlayışlar "təbiət" ilə, "süni" anlayışı bir insanla, onun sənəti, bacarığı ilə əlaqəlidir... İnsanın formalaşması onun əmək fəaliyyəti ilə, ictimai istehsalın yaranması ilə ayrılmaz dərəcədə bağlıdır və bu isə o deməkdir ki, insan öz fəaliyyətini məhz süni olanlardan başlayır. "Süni" anlayışı praktikamızda "təbii" dən fərqli olaraq yüksək elmi, texniki və sosial inkişafda daha yüksək dərəcəyə çatmaq deməkdir"( Кедров,1959: 18).

B. M. Kedrov tərəfindən verilən insan fəaliyyətindəki süni təriflə üst-üstə düşən bu görüşə görə, yer üzündə səslənən bütün dillər və ləhcələr sünidir.

Süni dillər termininin ən çox yayılmış istifadəsi, ümumilikdə təbii dillər kimi milli və etnik dillərə qarşı olan beynəlxalq dillərin layihələri ilə əlaqəlidir. İşdə qeyri-dəqiqlik yığını: əvvəlcə tarixi dillər təbiət sözlərindən təbii adlanır; ikincisi, yazılı olmayan dillərlə ədəbiyyat arasında heç bir fərq qoyulmur; üçüncüsü, beynəlxalq dildə olan layihələrə beynəlxalq dillər deyilir (beynəlxalq dil ilə onun layihəsi və ya layihələri arasındakı məsafə çox böyükdür); dördüncüsü, layihə dillərindən- posteriori və apriori arasında heç bir fərq qoyulmur. Süni dillər termininin polemikası hələ də davam etməkdədir.

"Dil modelləşdirmə prinsipləri" kitabının müəllifi P. N. Denisov ümumbəşəri bir dil ideyasının həyata keçirilməsinin mümkünlüyünə inamsızlığını dilə gətirdi: "Fərman vermək imkanına gəldikdə [?!]

bəşəriyyətin vahid bir dilə keçidi [dərhal vahid dilə!!], heç olmasa esperanto dilinin növü ilə yaradılsa, onda belə bir fürsət utopikdir ... Dilin həddindən artıq konservatizmi, sıçrayışların və qəfil dəyişikliklərin mümkün olmaması, dilin düşüncə və cəmiyyət ilə ayrılmaz bağlantısı və bir çox başqa dilçilik halları cəmiyyəti dağılmadan bu cür islahatın həyata keçirilməsinə imkan vermir" (Денисов, 1965: 10).

"Səslər və işarələr" kitabının müəllifi A. M. Kondratov hesab edir ki, bütün mövcud doğma dillər heç vaxt "süni şəkildə icad olunmayan" universal "dil ilə əvəz edilə bilməz." Bununla belə, köməkçi bir dil fikrini qəbul edir: "Yalnız və yalnız xarici insanlarla danışarkən istifadə olunan bir vasitəçi dil haqqında danışa bilərik" (Кондратов, 1966: 130-131).

Təbii dil- bu, fonologiyadan qrammatikaya və semantikaya qədər dilçiliyin sahəsidir. "Təbii dil insanın fikri fəaliyyətinin nəticəsi və vasitəsidir". Yalnız təbii dildə göndərilən informasiya insan tərəfindən başa düşülür. Bugünki təbii dillər cəmiyyətlərin tarixi inkişafının məhsuludur. İxtisas (məs.; kimya, riyaziyyat) və süni dillər (esperanto, ido və s.) müstəqil razılaşmaların konvensiyaları və ya sistemləridir. Ancaq onlar da təbii dilə söykənir. Təbii dildə ünsiyyət zamanı əşya və ya varlığın özü deyil, onları əvəz edən sözlər və onlar arasındakı əlaqələr mühüm rol oynayır (Veysəlli, 2010: 53).

O. Yespersen (1933: 18) "Dildə təbiət və sənət" ("Dildə təbiət və incəsənət") adlı kitabda milli dillər və inşa edilmiş dillər terminlərindən istifadə etməyi təklif etmişdir. Lakin, birincisi, bütün etnik dillər milli deyildir, ikincisi, qurulmuş dillər müxtəlif dərəcədə süni olur və üçüncüsü, dilin inkişaf mərhələlərini əks etdirən bu kimi dillər arasında kəskin fərq yoxdur (bu iki baxımdandır).

Bəşəriyyətin tarixi inkişafı zamanı ictimai həyatda ictimai şüurun artan rolu ilə dil getdikcə süniləşir. Fransız dilçi Mişel Breal inanırdı ki, yalnız instinktiv qışqırıqlar (səslər) "əsl mənada" təbii dil sayıla bilər. Eyni zamanda, davamlı olaraq təbii adlandırılan dillərin qüsurlarına diqqət çəkdi: "Yalnız vərdiş bu çatışmazlıqları bizdən gizlədir" (Лафарг,1930: 284).

Süni və təbii dil anlayışlarına qarşı yaranmış bu münasibət dilçilər arasında müxtəlif fikir ayrılığına səbəb olmuşdu. Ya bu qeyri-dəqiq termindən imtina etmək, ya da dəqiqləşdirmək lazım idi. Dilin müxtəlif sünilik dərəcələrinin müəyyənləşdirilməsi ilə bu vəziyyət aydınlaşdırıla bilər. Dil süniliyinin beş dərəcəsi ayırd edilə bilər:

1) süniliyin birinci dərəcəli dilləri - danışılmayan dillər (yazısı olmayan dillər) və ya milli dilin yazılmamış bir ləhcəsinin nitq elementi, tarixi dillərin və dialektlərin ədəbi normalardan əvvəlki və ya ondan xaric tələffüzü;

2) süniliyin ikinci dərəcəli dilləri –müəyyən normalarla tənzimlənmiş milli ədəbi dillər;

3) süniliyin üçüncü dərəcəli dilləri - hələ praktik və ya eksperimental təcrübədə tətbiq edilməmiş dillər, bəşəriyyətin dil təcrübəsi əsasında, tarixi dillər (apasterior dillər) əsasında yaradılan beynəlxalq dil layihələri;

4) süniliyin dördüncü dərəcəli dilləri - anlayışların və əlifba simvollarının fəlsəfi təsnifatı (apriori dilləri) əsasında bəşəriyyətin dil təcrübəsindən təcrid olunmuş şəkildə yaradılmış beynəlxalq dil layihələri;

5) süniliyin beşinci dərəcəli dilləri- kibernetik dillər, riyazi dil kodları və ən sadə formada hər cür kodlar (maşın dilləri) adlandırıla bilər, lakin burada söz dili onsuz da adi mənadan fərqli bir şəkildə istifadə olunur. Belə bir dildə şifahi, hətta eksperimental olaraq danışmaq olmaz.

Süniliyin birinci və ikinci dərəcəli dilləri tarix boyu tədricən icmalar, qəbilələr, millətlər və xalqlar tərəfindən yaradılmışdır. Bunlar canlı və ya artıq ölü dillərdir. Üçüncü və dördüncü sünilik dərəcəli dillərə gəldikdə isə, onlar qısa müddət ərzində bir şəxs və ya bir qrup insan tərəfindən tarixi dil materialları əsasında və ya onlardan ayrı vəziyyətdə yaradılmışdır: beynəlxalq dillərin layihələri olaraq, əksər hallarda bunlar ölü dillərdir. Bu dillərin yalnız bir qismi həyata keçirilmişdir (Volyapyuk ), bəziləri isə hələ də öz funksiyalarını yerinə yetirirlər (Esperanto və daha az dərəcədə digərləri). Yalnız süniliyin birinci dərəcəli dilləri şərti olaraq təbii (daha doğrusu, kvazi-təbii) adlandırıla bilər: belə dillər "kortəbii olaraq meydana gəlmiş" dillərdir.

Bu mənada, süniliyin ikinci və üçüncü dərəcəli dilləri yarı təbii- yarı süni dillər hesab edilir. Bunlardan birincisini özbaşına yarı təbii (kvazi-yarı-təbii) dil adlandırmaq olar: müəyyən normaya salınmamış xalq nitqinin anarxiyası və xaosu onlarda etnik qrupların dil praktikasının kortəbiiliyi şüurlu şəkildə, müəyyən dərəcədə bəzi hallarda mütəşəkkil şəkildə aradan qaldırılmağa başlandı. Bu vəziyyətdə, süniliyin üçüncü dərəcəli dilləri eyni konvensiya ilə yarı süni adlandırıla bilər: onların lüğəti tarixi təkamül yolu ilə inkişaf etmişdir, yalnız leksik elementlərin seçimi (kökləri) və qrammatik sistemi sünidir. Süniliyin dördüncü dərəcəli dilləri tamamilə sünidir, belə ki, onlarda dil təkamülündən, dil gerçəkliyindən heç bir əlamət yoxdur. Süniliyin beşinci dərəcəli dilləri - riyazi dil kodları - super sünidir.

Süniliyin birinci və ikinci dərəcəli dilləri. Dilçilikdə millətdən əvvəlki dillər termini qəbul edilmir, ancaq qəbilə dilləri, millətlərin dilləri terminləri qəbul edilir. Qəbilə və millətlərin dilləri əsasən yazılmır, hətta yazılı dili olanlar da normallaşdırılmayıb və demək olar ki, çap olunmuş ədəbiyyatı yoxdur. Qəbilə dillərini

normallaşan millət dilindən əvvəlki dil adlandırmaq olar. Dildə sünilik nə qədər azdırsa, heç bir ədəbi norma və ya yazı ilə bağlanmayan şifahi nitqin dəyişkən elementi o qədər güclüdür.

Ümumdünya dilinin yaranması, fəaliyyət göstərməsi və gələcək inkişafı üçün yaradılan Dünya İnterlinqvistika Mərkəzinin - Beynəlxalq Dil Akademiyası və filiallarının nəzarəti altında inkişaf etdirilməsinin milli dillərin fəaliyyətinə və inkişafına müsbət təsir göstərəcəyini kifayət qədər əsasla qəbul etmək olar.

Süniliyin üçüncü və dördüncü dərəcəli dilləri - posteriori və apriori. Süniliyin ikinci dərəcəli dilləri birinci dərəcəli dillər əsasında yaranıb. Bunlar normallaşdırılmamış dillər əsasında normallaşdırılmış dillərdir, yəni millət dillərindən əvvəlki dillərdən yaranan milli dillərdir. Üçüncü süni səviyyəli dillər ümumdünya dilinin posterior layihələri, ikinci dərəcəli süni dillərin materialları əsasında yarandı.Yer üzündə səslənən çoxsaylı dillər arasında süniliyin ikinci dərəcəsindən üçüncü dərəcəsinə keçid növlərinə aid nadir nümunələr mövcuddur. Bunun ən parlaq nümunəsinə Norveçdə rast gəlmək olar. Burada, demək olar ki, hər kənddə, hər vadidə, hər fiordun sahillərində bir ləhcə, hətta bir adət var idi. Norveçlilər rəsmi dilləri olan - danimarka-norveç, əsasən danimarka adlanan *riksmol* və ya "kitab" mənasını verən *bukmol* dilini birləşdirdilər. Lakin XIX əsrin ikinci yarısında şəhər əhalisinin və eyni zamanda ədəbiyyatın dilinə çevrilən bu xarici dilə qarşı şair-filoloq kəndli İvar Osei bir neçə kəndli ləhcəsinin elementlərindən ibarət yeni bir dil-landsmolu yaratdı. Landsmolun əleyhdarları dili süni olduğu üçün rədd etdilər, lakin dil ölkə daxilində yayıldı, bukmol qədər canlı və ədəbi oldu, Nyunorsk (Yeni Norveç) kimi tanındı və Norveç məktəblərinin böyük bir hissəsində tədris də bu dildə aparılır. Beləliklə, bir millətin iki milli dili meydana gətirildi. Bu yaxınlarda bukmol və nyunorsk dilləri əsasında yaradılan - samnorsk adlanan üçüncü bir dil meydana gəldi və bu, yaradıcılarının və dəstəkçilərinin planına görə Norveç xalqının vahid milli dilinə çevrilməlidir (Геннадий Фиш, 1963: 158-172).

Ehtimal ki, vahid süni dil təbii olaraq bəşəriyyətin dil təcrübəsinə əsaslanaraq üçüncü dərəcəli süniliyin dili olacaqdır.

Oxuya bilməyən, yaza bilməyən, ədəbi normaları olmayan və ya bu normalardan istifadə etməyən bir dildə və ya ləhcədə danışan Yer kürəsinin əhalisinin əhəmiyyətli bir hissəsi hələ də dil inkişafının ilk mərhələsindədir. Dilçilik praktikasında ədəbi–milli standartlara əsaslanan cəmiyyətlər dil inkişafının ikinci mərhələsindədirlər, yalnız öz dillərində danışmırlar, həm də oxuyub-yazırlar. İnsanların nisbətən kiçik bir hissəsi (lakin yüz minlərlə insan var), üçüncü dərəcədə süniliyin bu və ya digər dil layihəsinə- beynəlxalq birliyə qoşuldu. Ümumbəşəri dil problemi sağlam bir elmi əsasda həll edildikdən və dünya xalqları yeni bir tipdə ortaq dil əldə etdikdən sonra insan cəmiyyəti tədricən üçüncü dilin yüksək inkişaf mərhələsinə yüksələcəkdir. Bəşəriyyətin linqvistik inkişafında dördüncü pilləyə yüksəlib-çatmayacağını indi mübahisə etmək çətindir, lakin nəzəri cəhətdən bu tamamilə məqbuldur.

1856-1858-ci illərdə Beynəlxalq Dilçilik Cəmiyyəti tərəfindən yaradılan komitə ilk dəfə olaraq bütün layihələri aşağıdakı şəkildə təsnif etdi:

1. posteriori (təbii dillərin materialı üzərində qurulmuş);
2. priori (təbii dillərlə ünsiyyətdən məhrum);
3. qarışıq növ.

Bu dildə danışanların kollektivinə münasibətdə beynəlxalq süni dillər qeyri-ictimailəşmiş və ictimailəşmiş dillərə, geniş və dar sahədə yayılma dillərinə, sabit və qeyri-sabit, bir nəslin dillərinə və bir çox nəsillərin dillərinə, bir motivasiya dillərinə və bir çox motivasiya dillərinə bölünür.

D. Easton süni dilləri "kompüter", "köməkçi" (köməkçi) və "bədii" (sənətkarın dili - dilçiliklə əlaqəli olmayan və estetik dəyəri ifadə edən bir yazıçı tərəfindən yaradılan bir dildə) dillərə bölür (Лесевич,1903: 65).

Riçhard Harrison süni dilləri aşağıdakı şəkildə təsnif edir:

1. Posteriori tipli süni dillər.
1.1. Modifikasiya olunmuş təbii dil
1.2. Modifikasiya olunmuş Süni Dil
1.3. İnteraktiv Süni Dil Sistemi
1.4. Yaxın əlaqəli təbii dillərin birləşməsindən yaranan süni dil
1.5. Heterogen təbii dillərdən yaranan bir dil.
2. Apriori tipli süni dillər.
2.1. Nitq fəaliyyəti prosesini nəzərdə tutur (fəlsəfi kateqoriyalı, məntiqi kateqoriyalı )
2.2. Nitq fəaliyyəti prosesini nəzərdə tutmur (paziqraflar, nömrələrin və ya qeydlərin dilləri, pazimologiya (işarə dilləri)) (Исаев, 1991: 164).

Süni dilləri leksik tərkibinə görə təsnif etməklə yanaşı, onların yaranma məqsədi və quruluş tərkibi də çox vaxt nəzərə alınır. M. Rosenfelder quruluş və məqsəd meyarlarından istifadə edərək dilləri belə qruplaşdırır:

Quruluşuna görə:
1. Avropa tipli
2. qeyri-Avropa tipli
Təyinata görə:
1. məntiqi dil
2. köməkçi dil
3. eksperimental dil (Исаев, 1991: 169).
F.Veysəlli isə süni dillərin yaranmasında istifadə edilən prinsipləri belə təsnif edir:
1. aprioristik prinsip- insan dilini əvəz edə bilməyən simvollar sistemindən ibarət süni dil;
2. aposteriorik prisip- təbii dillərin materiallarından istifadə edilməklə yaradılan süni dil;
3. qarışıq prinsip- hər iki pripsipin göstəricilərindən istifadə edilən süni dil (Veysəlli, 2007: 45-46).

Bütün anlayışların təsnifatına və köklərin əlifba simvolizminə əsaslanan universal dilin priori layihələri XX əsrdə yaradıldı. 1906-cı ildə səkkiz səhifəlik broşurada Edvard P. Foster (ABŞ) tərəfindən nəşr olunan Ro layihəsini nəzərdən keçirək. Sonradan bunun bir neçə nüsxəsi izlənildi və 1920-ci ildə Ro-İngilis dili lüğəti nəşr olundu. Yarım əsr keçdi və Ro yalnız bütün dünyada üzvlər də daxil olmaqla "həqiqətən də beynəlxalq bir cəmiyyətə" çevrilməyi xəyal edən (və ya xəyal?) bir ovuc xəyalpərəstin əyləncəsi olaraq qaldı.

Digər apriori layihələrində olduğu kimi, burada hər bir hərf bir simvoldur. Və bütün dil, ən kiçik detallarla ahəngdar şəkildə tərtib edilmiş bir sxem kimidir. Eba - olmaq, neba - olmamaq, ab el - mən, ad el - bu, taf - gün, tafab - bazar, tafac - bazar ertəsi, ba - şey,əşya, bab - element, babgad - hidrogen, beb - qaz, bebaf - buxar, bib - göy, bicam - hava, bical - iqlim, cibo - bərabər, cibno - qeyri-bərabər, cid - çox, cidno - bir az, eb selab – ümid etmək, eb kecav - gəzmək ...(Foster, 1921: 18).

Praktiki istifadə baxımından priori dilləri tamamilə uğursuz oldu. Əsas problem fəlsəfə ilə müəyyənləşdirilməli olan anlayışlar arasındakı təbii sərhədlərin məhv edilməsi və elm adamlarının beynəlxalq ünsiyyət üçün uyğun olmayan daha çətin bir dil yaratması idi. Digər səbəb isə, priori dilinin simvollar üçün böyük yaddaş tələb etməsi idi.

Posteriori dilləri təbii dillərdən alınan fonetik, leksik, semantik, qrammatik elementlər əsasında yaranır. Posteriori süni dillər təbii dillərdən daha sadə quruluşdadır.

2. İnterlinqvistlər üçün medializasiya (ortalama) prinsipi maraq doğurur, buna əsasən İ. Veisbart Medialın (1922) layihəsi qurulmuşdur. Bu prinsip beynəlxalq dil sözünün iki və ya daha çox milli dildən meydana gəlməsindən ibarətdir. Məsələn, Veisbart alman dilindəki freude və fransız dilindəki joi (jua) sözlərindən, "sevinc" mənasını verən joide (joyde) sözünü düzəldir. Bu prinsipə əsasən bir neçə digər dinlərarası layihələr, xüsusən də 1960-cı ildə ABŞ-da Ceyms Kuk Broun tərəfindən nəşr olunan loqlan dili yaradıldı. Bu dil üçün səkkiz təbii dildən əhəmiyyətli (leksik cəhətdən tam dəyərli) sözlər medializasiya olunmuşdur, məsələn groda - böyük, blana - mavi və s. Medialized lüğəti süniliyin üçüncü dərəcəsindən dördüncü dərəcəsinə keçid olaraq xarakterizə edilir (https://en.wikipedia.org/wiki/Esperanto).

Süni dil layihələrinin quruluşunu aşağıdakı şəkildə təsnif etmək olar:
1. Apriori dilləri - anlayışların məntiqi və ya empirik təsnifatları əsasında yarananlar: loqlan, lojban, ro, solresol, ifquil, ilakş;
2. Posteriori dilləri – mövcud dillərin lüğəti əsasında qurulmuş dillər: interlingua, oksidental;
3. Qarışıq dillər - sözlər və söz formalaşması qismən qeyri-süni dillərdən götürülmüş, qismən süni icad edilmiş sözlər və söz quruluşu elementləri əsasında yaradılmış dillər: volapyuk, ido, esperanto, neo.

Süni bir dilin həqiqiliyini üç amil müəyyənləşdirir: məqsəd, orijinallıq və ölçü.

Tarixən süni dil yaradanlar əvvəlcədən öz məqsədlərini müəyyənləşdirmiş, sonra isə bu istiqamətdə layihə hazırlayıb gerçəkləşdirmişlər. Dilin məqsədi ən aydın müəyyənləşdiricidir. Süni dilin ölçüsü də vacibdir. Belə ki, bu dillər yalnız sözlərin miqdarını yox, eyni zamanda məlumatın nə dərəcədə söylənilə biləcəyini göstərir: say sistemlərinə və ya müəyyən sintaktik vəziyyətlər üçün qaydalara sahib olmayan dillər bir çox fikirləri izaholunmaz hala gətirə bilər. Bu amil ədəbi və əyləncə dairələri üçün inkişaf etdirilən bir çox dillərin iflasa uğramasıdır: öz məqsədləri üçün mövcud olan orijinal qrammatika və söz ehtiyatlarını ehtiva etdikləri halda, bir neçə yüz qeyri-dəqiq söz və bəzən mövcud olmayan qrammatika ilə öyünürlər. Model Dillər elektron bülleteninin redaktoru Ceffrey Henninqin sözlərinə görə, "Süni dil ünsiyyət üçün istifadə ediləcək bir dildir. Belə bir dil ən azı 1000-2000 sözdən ibarət bir lüğət və detallı bir qrammatika tələb edir". Süni dil təbii dillər əsasında formalaşır, lakin təbii dil əsasında formalaşmayan dillər də mövcuddur.

Beləliklə, süni beynəlxalq dilin yaradılması perspektivlidir, baxmayaraq ki, hadisələrin əlverişli inkişafı ilə beynəlxalq dilin təbii şəkildə işlənməsi "ingilis, ispan və ya rus kimi böyük milli dillərdən biri" tərəfindən

həyata keçirilə bilər (Бодуэн де Куртенэ, 1963: 139). Dillərin güclənməsi və ya əksinə məhv edilməsi xalqların xarici həyat şəraitinə, subyektiv və obyektiv amillərə kömək edir.

Təbii dildən fərqli olaraq süni dil müxtəlif elm sahələrini əhatə edə bilir. Bu baxımdan süni dillər aşağıdakı şəkildə təsnif edilir:

1. Proqramlaşdırma dilləri və kompüter dili (kompüterlərdən istifadə edərək məlumatların avtomatik işlənməsi dilləri).
2. İnformasiya dili (müxtəlif məlumat emal sistemlərində istifadə olunan dillər);
3. Formal dil (elmi faktların və riyaziyyat, məntiq, kimya və digər elmlərin nəzəriyyələrinin simvolik qeyd olunması üçün nəzərdə tutulan dillər);
4. Mövcud olmayan xalqların ədəbiyyatda və kinematoqrafiyada yaradılmış dilləri (Bədii və ya əyləncəli məqsədlər üçün yaradılan, mövcud olmayan xalqların dilləri, məsələn: "Avatar" filmi və "Star Trek" elmi fantastik seriyası üçün Mark Ocrand tərəfindən icad edilmiş Na-V dili, J. Tolkien tərəfindən icad edilmiş Klingon və Elven dili);
5. Beynəlxalq yardımçı dillər (planlaşdırılmış) - təbii dillərin elementlərindən yaranmış və millətlərarası ünsiyyət üçün köməkçi vasitə kimi təklif olunan dillər (ido, volapük, interlingua, esperanto, loglan, oktal və s.).

Hal-hazırda, planlaşdırılan dillərin başqa bir tətbiqi sahəsi müəyyən edilmişdir - maşın tərcüməsi sahəsi. Məsələn, DLT (Distribuita Lingvo-Tradukado) yayılmış tərcümə layihəsində Esperanto daxili dil üçün əsas götürülür. Layihənin məqsədi İnternet üçün maşın tərcüməsi sistemi yaratmaqdır. DLT layihəsində, göndərmədən əvvəl bütün mesajlar bir daxili dilə tərcümə olunur və bu formada şəbəkə vasitəsilə göndərilir. Mesajı aldıqdan sonra yenidən alıcının dilinə tərcümə olunur. Beləliklə, hər bir istifadəçi mesajları yalnız öz dillərində göndərir və qəbul edir.

Planlaşdırılan bir dilin digərlərindən üstün cəhətləri odur ki, bu, bir tərəfdən tam ünsiyyət vasitəsidir, praktikada sınanır, digər tərəfdən də süni olduğuna görə rəsmiləşdirmək daha asandır.

6. Süni intellekt dili- Süni intellekt robotların dilidir. Bu dil fikri daha sürətlə ifadə etməyə hesablanır. "Facebook" çat botları öncə ingilis dilində ünsiyyətdə olsalar da, sonradan sürətli ünsiyyət üçün yeni dil yaradıblar. Robotlaşmağa doğru böyük bir yol almışıq, lakin dilin fəaliyyəti nəticəsində yaranan ünsiyyət forması hələ ki ən optimal variant olaraq qalmaqdadır (http://heb.science.gov.az/).

## Nəticə

Beynəlxalq süni dillərin cəmiyyətdə və müxtəlif elm sahələrində mühüm rolu vardır. Belə ki, kimya, riyaziyyat, nəzəri fizika, kibernetika, rabitə, stenoqram, kompüter və məntiq elmlərində süni dillərin rolu əvəzedilməzdir. Məqalədə təbii dil və süni dil terminlərinin izahı verilir, təbiilik və sünilik dərəcələri müəyyənləşdirilir. Süni dil layihələri quruluşuna görə apriori dilləri, posteriori dilləri və qarışıq (hibrid dil) dillər kimi təsnif edilir. Müxtəlif elm sahələrini əhatə edə bilməsi baxımından süni dillər proqramlaşdırma dilləri, informasiya dili, formal dil, planlaşdırılmış dil, qondarma dil (uydurma dil), süni intellekt dili şəklində qruplaşdırılır. Dil süniliyinin beş dərəcəsi ayırd edilir və süniliyin dördüncü dərəcəli dillərinin tamamilə süni olduğu, onlarda dil təkamülündən, dil gerçəkliyindən heç bir əlamət olmadığı qənaətinə gəlinir. Lakin təbii və süni dillər arasında keçilməz sədd çəkmək olmaz, çünki təbii dillər hər bir süni dil üçün baza rolunu oynayır. Həm təbii, həm də süni dillər insan təxəyyülünün müəyyən normalarla tənzinmlənmiş ifadə vasitələridir.

## Ədəbiyyat

1. Azərbaycan dilinin izahlı lüğəti. 4 cilddə, IV cild, Bakı: Şərq-Qərb, 2006, 712 s.
3. Manafoğlu R., Tağısoy N., Kamal R.. İzahli tərcüməşünasliq terminləri lüğəti. Bakı: Mütərcim, 2010, 164 s.
4. Veysəlli F. Dil. Bakı: Təhsil NPM, 2007, 291 s.
5. Veysəlli F.Y. Semiotika. Bakı: Mütərcim, 2010. 336 s.
6. АН СССР. Государственная Академия Истории материальной культуры имени Н.Я. Марра. Л.: ГСЭИ, 1936, 537 с.
7. Бодуэн де Куртенэ И.А. К критике международных искусственных языков // Бодуэн де Куртенэ И. А. Избранные труды по общему языкознанию. Т. II, М., 1963, с. 365 с.
8. Бодуэн де Куртенэ И.А. Язык и языки. "Брокгауз и Эфрон", т. 16, 1904, 542 с.
9. Булаховский Л. На путях материалистического языковедения. Правда, 13 июня 1950 г.
10. Геннадий Фиш. Норвегия рядом. Москва: Сов. писатель, 1963, 480 с.
11. Денисов П. Н. Принципы моделирования языка. М.: Наука, 1965. 208 с.
12. Исаев М. И. Проблемы международного вспомогательного языка. М.: Наука, 1991, 263 с.
13. Кондратов А. М. Звуки и знаки. М.: Знание, 1966. 208 с.

14.Костомаров В.Г. Проблема общественных функций языка и понятие «мировой язык» / В.Г. Костомаров // Социолингвистические проблемы развивающихся стран. – М.: Наука, 1975, 370 с.
15.Лесевич В. В. Международный язык культурных сношений. - "Русская мысль", 1903, № 2, стр. 284
16.Поль Лафарг. Язык и революция. Французский язык до и после революции. Перев. с франц. М.-Л., Изд-во "Academia", 1930, стр. 30.
17.Zamenhof L.L. - Дръ. Эсперпанто. Международный языкъ : Предисловіе : Полный учебникъ por Rusoj. Варшава, 1887, 232 с.
18.Foster E.P. Roup English key to Ro, the world language. The Ro Language Society, Waverly, West Virginia, USA, 1921, 32 p.
19.Jespersen O. Nature and Art in Language. Copenhagen, 1933, 434 p.
20.http://heb.science.gov.az/
21.https://en.wikipedia.org/wiki/Esperanto

**Rəyçi: prof. A.Bayramov**

Göndərilib: 01.08.2020 Qəbul edilib: 03.08.2020

DOI: 10.36719/2663-4619/56/47-50

**Göyərçin Abid qızı Mustafayeva**
Nizami Gəncəvi adına Milli
Azərbaycan Ədəbiyyatı Muzeyi
goyercin.mustafayeva@yandex.com

# TÜRK-İSLAM ƏDƏBİYYATININ İLK BÖYÜK ABİDƏSİ OLAN "KUTADQU BİLİG" ƏSƏRİ HAQQINDA

**Xülasə**

Balasaqunlu Yusufin "Kutadqu Bilig" əsərininin ideyası dövlətin iqtisadı gücünü möhkəmləndirmək, hərbi gücünü artırmaq, ağıllı, xalqa xeyirli qanunlar qəbul etmək, dövlətlə xalq arasındakı problemləri həll etmək, məmləkətdə ədaləti, sülhü qorumaq idi.

"Kutadqu Bilig" dastanı əsrlər keçsə də Türkistanda, Türk dünyasında hər zaman sevilərək oxunulan bir abidə olaraq, insan və dövlət həyatının hər sahəsini əhatə edir.
***Açar sözlər:*** uyğur, mədəniyyət, uyğur ədəbiyyatı, xaqanlıq.

## About the first great monument of Turkish-Islamic literature «Kutadgu bilig»

**Summary**

The idea of Yusif Balasagunlu's work "Kutadgi Bilig" was to strengthen the economic power of the state, increase its military power, adopt wise laws that are good for the people, solve problems between the state and the people, maintain justice and peace in the country.

The epos "Kutadgi Bilig" is a monument that has always been loved and read in Turkestan and the Turkic world for centuries and covers all spheres of human and state life.
***Key words:*** Uyghur, culture, Uyghur literature, khaganate.

## Giriş

VIII-IX əsrdə Qərbi Göytürk xaqanlığının inkişafı nəticəsində əvvəlcə Türkeş xaqanlığı, sonra Karluq xaqanlığı və IX əsrin birinci yarısından XII əsrin əvvəllərinədək Şərqi və Qərbi Türküstan ərazisində Qaraxanlı dövləti yarandı. Bu proses Mərkəzi Asiya bölgəsində onların siyasi, sosial-iqtisadi və mədəni inkişafı, eləcə də Soqd əsilli türk boyları ilə uzun müddət qarşılıqlı əlaqəsi və birləşməsi nəticəsində başa çatmışdır. Göytürk kaqanlığından başlayaraq Yeddi-su və Tyan-Şan torpaqlarında yerli köçərilər, həmçinin Soqd əsilli boyların da türkləşməyə doğru getməsinə baxmayaraq, etnik proseslər çox ləng gedirdi. Türgeş xaqanlığının hakimiyyətdə olduğu dövrdə, yəni VIII əsrin ortalarına yaxın bölgədə yaşayan insanların həm boy, həm mədəniyyət, həm də dil bölgüsü tamamilə itirilməmişdi.

"Orta Asiya karluklarının böyük və güclü boylarından sayılan Çigil və Yağma boylarının tayfalar halında gəlib Tian - Şan və Yeddi-Suya yerləşmələri (746-766-çı yüzillik) burada əvvəlki dövrdə başlamış sosial-iqtisadi və mədəni prosesləri dəyişmədən çox ciddi siyasi və etnik dəyişikliklərə səbəb oldu" (Taşagıl, 2013: 239-240).

Göytürk yazısından sonra Saqd əlifbasından yararlanaraq Uyğurlar tərəfindən meydana gətirilən Uyğur əlifbası Türk əlifbası tarixində önəmli rol oynadı. Çünki o dövrdə Manihaizm, Budizim və Qarahanlı İslamı əsərlərinin bir çoxu bu əlifba ilə yazılmışdır.

"VI-IX əsrlərdə Göy Türk dövlətləri daxili və xarici düşmənlərin hücumlarından varlıqlarını qısa sürdürüb yıxılsa da özlərindən sonra bənzərsiz yeni yazı, yeni əlifba qoyaraq türklərin tarixini və mədəniyyətini araşdırmaq üçün bizlərə dəyərli məlumatlar qazandırmışdır". (Кононов, 1983: 495).

IX-XI əsrlərdə Çuy və Talas vadilərində var olan şəhərlərin qalıntılarında aparılan arkeoloji qazıntılar sonucunda ortaya çıxarılan saxsı qabların üzərinə Soqdça yazılmış qısa mətnlər tapılmışdır. Bu mətnlərdəki yazılardan, Türklər və Soqdların birgə hayat şəraitində bərabər haklara sahip olduqları anlaşılır.

"Yeddi-sudakı türklər bu bölgədə yayılan manilik və xaçpərəstliyə üz tutmağa başlamışdılar. Onlar, türkçə danışığı yazıya çevirmək üçün Soqd əlifbası əsasında hazırlanmış bir əlifba və Göytürk runi əlifbası kimi iki növlü yazı sistemindən istifadə edirdilər" (Кляшторный, 2003: 169).

Əsirlərdən bəri Uyğur Türkləri qardaş Türk boyları ilə bərabər Orta Asya və Şərqi Türkistanda böyük dövlətlər qurmuşlar.

Türk boylarının Qaraxanlı dövlətinin siyasi ve iqtisadi əsası çərçivəsində inkişafının önəmli bir sonucu da Buğrahan dili (Yusuf Has Hacib) ya da hak aniyyə (Kaşgarlı Mahmud) adlandırılan ədəbi dilin ortaya çıxmasıdır.

Şərqi Türküstan və uyğur türkləri inkişaf edərək zəngin türk adət ənənələri və mədəniyyəti tarixində çox önəmli yerdə durur.

XX əsrin görkəmli türk alimi S.M.Kaşğarlı uyğur türk mədəniyyətinin tanıdılması, öyrənilməsi, araşdırılması və türk mədəniyyəti, dili və ədəbiyyatının inkişafı yolunda çox işlər görmüşdür. Alimin araşdırmalarında Türk dünyasının dəyərli ziyalılarından Mahmud Kaşğari, Yusuf Has Hacib, Əlişir Nəvai, Zəlili, Yunus Əmrə, Mövlanə, Əhməd Yasəvi, Hacı Bəktaşi Vəli və başqalarının yaradıcılığı Çağdaş Uyğur şeirində bu gün də öz aktuallığını saxlamaqdadır.

Sultan Mahmud Kaşğarlı qədim uyğur əlifbasıyla yazılan əsərlərin sayının 800 parçadan çox olduğunu, bu əsərlər içində buddizim və manixeyliklə bağlı şeirlər, hekayələr və dramların ən gözəl nümünələrindən: "Oğuznamə", "Altun yaruk", "İki Tiginin hekayəsi", "Böyük Maymun Patmaralı", 27 pərdəli dram "Maytrismit"dən məlumat verir.

Alim Qaraxanlılar dövründə uyğur-türk mədəniyyəti və ədəbiyyatnın ən yüksək dövrünü yaşadığını göstərir. Bu dövrdə Qaraxanlı hökmdarı Sultan Saltuk Buğra xanın 935-ci ildə inanc olaraq islam dinini seçməsi və Qaraxanlılar dövlətində islam dinini dövlət dini qəbul etməsi ilk türk-islam ədəbiyyatının təşəkkül tapdığını qeyd edir.

Sultan Mahmud Kaşğarlı məqalələrində Qaraxanlılar zamanında Hakaniyyə türkcəsiylə və ya Kaşğar türkcəsilə şair, alim, Yusuf Has Hacibin 1069-cu ildə Qaraxanlı hökmdarı Tavğaç Buğra xana təqdim etdiyi, türk dövlət fəlsəfəsi və adət-ənənələrini ortaya qoyan, dövlət və siyasət haqqında yazılmış əsəri "Kutadqu Bilik" dastanı, Mahmud Kaşğarlının 1075-ci ildə tamamlayıb Abbasi xəlifəsi Əbülqasım Abdullah Muktədi Bi Əmrullaha təqdim etdiyi ilk türk dili lüğəti və türk mədəniyyəti xəzinəsi "Divani-Lüğət-ii Türk" əsəri, Yuğnaklı Ədip Əhmədin dördlüklərlə yazmış didaktik dastanı "Atabətül Hakayik" kimi nadir əsərlərin yalnız dil baxımından deyil, ədəbiyyat baxımından da çox dəyərli əsərlər olduğunu deyir. Bu qiymətli əsərlər özündən sonrakı dövrlərdə türk dili və ədəbiyyatının inkişafı üçün böyük təsiri olan abidələrdən olduğunu qeyd edir.

Uyğur türkləri, qədim zamanlardan başlayaraq üç böyük qədim mədəniyyət (Qədim Çin mədəniyyəti, qədim Hind mədəniyyəti, qədim Yunan mədəniyyəti), üç böyük din (buddizm, xaçpərəstlik, islam), üç böyük dil ailəsi (Ural-Altay, Çin-Tibet, Hind-Avropa dil ailəsi), üç böyük iqtisadi sektorun heyvandarlıq, kənd təsərüfatı və İpək yolu ticarətinin bir-biriylə sıx halda inkişaf etdirərək (Türk dünyasının adət - ənənələri, mədəniyyəti, insanlıq mədəniyyəti) Türk dünyasında önəmli yer tutmuşur.

"Türk tarixində ilk müsəlman türk dövləti olaraq bilinən Qaraxanlılar zamanında türk mədəniyyəti iki böyük şəxsiyyət yetişdirmişdir. Bunlardan biri Kaşğarlı Mahmud, o biri isə Yusuf Has Hacibdir. Kaşğarlı Mahmud necə dilçi, etnoqraf, tarixçı, dialektoloq, coğrafiyaçı, xəritəçi, folklorçu, şair və ərəb dilinin bilicisi idisə, Yusuf Has Hacib də din, mifologiya və dinlər tarixi, fəlsəfə, mənəviyyat bilicisi, təhsil-tədris, ailə məsələləri, əxlaq, qadın, içki, atalar sözü, qanun və adət bilicisi, dövlət və saray təşkili, siyasət və diplomatiya, ordu (strategiya və taktika), tarix, coğrafiya, xalq bilgisi, aşpazlıq, əkinçilik, heyvançılıq və məhsullar, tecim, mal, əl sənətləri, maliyyə, pul, nəqliyyat" kimi geniş sahədə mükəmməl və ensiklopedik bilgiyə sahib idi". (Dilaçar, 1972: 145).

1018-ci ildə Qarahanlı dövlətinin paytaxtı olan Balasaqun şəhərində anadan olmuş Yusuf Has Hacib kiçik yaşlarından yaxşı təhsil alaraq ərəb-fars dili və ədəbiyyatını gözəl bilən, dövrünün elm və mədəniyyətini yaxşı öyrənən bir insan olub.

Ədib Firdovsinin "Şəhnaməsi"ni, Əbunasir Fərabinin, Əbu Əli Sinanın ərəb dilində yazılmış fəlsəfə əsərlərini, yunan filosoflarının əsərlərini yaxşı öyrənmiş və araşdırmışdır.

Bu biliklər sayəsində Yusuf Has Hacib türk ədəbiyyatının ilk böyük əsəri olan "Kutadqu Bilig" əsərini 1069-cu ildə Balasaqunda yazmaga başlamış, 1070-ci ildə Kaşqarda tamamlayaraq, Şərqi Qaraxanlı hökümdarı Tabgac Uluğ Buğra Qaraxan Əbu Əli Hsan bin Süleyman Arslan xana təqdim etmişdir. Əlli yaşından sonra Balasaqundan Kaşqara gələn Yusuf hökümdarın hüzurunda oxuduğu bu əsər sayəsində Has Hacib vəzifəsinə gətirilir. Yəni, Has Hacib rütbəsinə sahib olur. Qalan ömrünü dövlətin inkişafına xidmət edən Yusuf Has Hacib 1085-ci il 67 yaşında Kaşqarda vəfat edir.

Kaşqardakı Tümen çayının kənarındakı "Barıgah" kəndində dəfn olunun Yusuf Has Hacibin qəbri sonralar - (1533-1556) çaya sel gəldiyindən Sultan Abdu Rəşid xanın əmriylə buradan köçürülərək indiki "Paynap" kəndində dəfn edilir.

Kaşqar şəhərinin genişlənməsi nəticəsində Yusuf Has Hacibin məzarı şəhərin mərkəzinə yaxın düşür. Məzar və türbə 1987-1988-ci illərdə yenidən bərpa olunur.

"Kutadqu Bilig" haqqındda S.M. Kaşqarlı belə məlumat verir ki, əsər məsnəvi tərzində qələmə alınmış 6645 beytlik bir dastan olub məzmun baxımından siyasətnamədir. Əsər sadə, anlamlı dildə yazıldığından illərcə oxunmaqla qalmayıb, türk xalqının ortaq ədəbi yazı dilinin inkişafında çox önəmli rol oynamışdır.

Qaraxanlılar dövründə meydana gələn türk-islam ədəbiyyatının ilk böyük abidəsi olan “Kutadqu Bilig” əsərinin bizə bəlli olan üç nusxəsi vardır.

Birinci nüsxə Teymurilər nəslindən olan Şahruhun höküm sürdüyü 1439-1440-cı illərdə bir uyğur xəttatı tərəfindən qədim uyğur əlifbasıyla Heratda üzü köçürülmüş və 1475-1476-cı illərdə Tokat şəhərinə gətirilmişdir.

Bu nüsxəni Teymuri padşahlarından birinin Osmanlı padşahına hədiyyə göndərdiyi söylənilir. Çünki bu dövrdə Osmanlı imperatorluğunun dəyərli xəzinə və əşyaları Tokat şəhərində qorunur. Sonra nüsxə 1491-1492-ci illərdə Abdürrezzak Bahşi üçün Tokatdan İstanbula gətirilir.

XIX yüzülün başlarında Almaniyanın İstanbuldakı elçiliyində katib olaraq çalışan tanınmış şərqşünas Barood Hon Hammer bu nüsxəni satın alaraq Vyana şəhərindəki dövlət kitabxanasına təqdim etmişdir.

İkinci nüsxə Qahirə və ya Misir nüsxəsidir ki, bu hissə 1896-cı ildə Qahirədə Hidiv (bu günki Kral) kitabxanasının o zamankı müdiri alman alimlərindən Morietez tərəfindən tapılmışdır. Nüsxə ərəb əsilli uyğur əlifbasıyla gözəl bir şəkildə üzü köçürülür. 392 səhifə, 73 bab olub, başqa nüsxələrə görə nisbətən əksiksiz hissədir. Bu nüsxə akademik Radloff tərəfindən elm aləminə tanıdılmışdır.

Üçüncü nüsxə Fərqanə nüsxəsidir ki, 1914-cü ildə Əhməd Zəki Vəlidi Togan tərəfindən Fərqanə vilayətinin Namenqan şəhərində tapılmışdır.

1924-cü il Buxaralı müəllim Fikrət “muarif və okutkuçi” (“Təhsil və tədris”) jurnalında bir məqalə çap etdirərək bu nüsxə haqqında məlumat verir.

Nüsxə hal hazırda Özbəkistan Elmlər Akademiyasının Şərq Əlyazmaları İnistutunda qorunub saxlanmaqdadır.

Prof. Dr. Sultan Mahmud Kaşqarlı qeyd edir ki, “Kutadqu Bilig”in siyası, hüququ, ictimai, əxlaqi tərəflərini araşdıran türk və qərbli alimlər, əsərdəki Farabı və İbni Sina təsirlərini bu filosoflar vasitəsiylə gələn Əflatun və Aristo təsirinin olduğunu göstərməyə çalışmışlar. Əsərdə Hind-İran və Çin təsirlərinin oldugu da araşdırılır. Lakin bütün bu təsirlərə çox önəm verməmək, millilik “Kutadqu Bilig”də çox saglam bir təməl olaraq yer aldığını unutmamaq, əksinə kənar təsirlərin olması əslində insanlığın ortaq dəyərləri olduğunu yadda saxlamaq lazımdır.” (2004: 163).

Yusuf Has Hacib vətənpərvər, dövlətini hər fəlakətdən qorumaq, xalqın rifahını yüksəltmək, onları azadlığa, səadətə qovuşdurmaq üçün bu əsəri yazmışdır.

Prof. Dr. Sultan Mahmud Kaşqarlı onu da qeyd edir ki, “Bəzi alimlər “Kutadqu Bilig”in yazılmasında Yusuf Has Hacibin “Şahnamə”nin təsiri var.” Alim bu fikrin doğru olmadığınıa aydınlıq gətirərək yazır: “İran şairi Firdovsi nəzim vasitəsilə İranın əfsanəvi tarixini təsviri şəkildə ifadə etməyi əsas hədəf seçmişsə, böyük alim, mütəfəkkir, məhşur şair Yusuf Has Hacib nəzim vasitəsiylə Türk dövlət idarəsinin inkişafına, dövlət hüququ, sosual əxlaq kimi əsas problemləri həll edilməsinə yonəltmişdi” (2004: 163).

Əsərin ideyası dövlətin iqtisadi gücünü möhkəmləndirmək, əsgəri (hərbi) gücünü artırmaq, agıllı, xalqa xeyirli qanunlar qəbul etmək, dövlətlə xalq arasındakı problemləri həll etmək, məmləkətdə ədaləti, sülhü qorumaq idi.

“Kutadqu Bilig” dastanı əsrlər keçsə də Türkistanda, Türk dünyasında hər zaman sevilərək oxunulan bir abidə olaraq, insan və dövlət həyatının hər sahəsini əhatə etdiyi üçün əsərə “Kamusnamə” (Elim Çeşməsi) adlandırırlar. Başqa bir sözlə “Kutadqu Bilig” dastanı “tövsiyənamə”, “təmsilnamə”, “siyasətnamə” və “dövlətnamə” dən ibarət böyük bir abidədir.

## Nəticə

“Kutadğı Bilig” Hakaniyə türkcəsiylə yazıldığından əsər Türküstan ellərinin ən mükəmməl bir ədəbi abidəsi sayılır. Əsərin şöhrəti bir çox ölkələrə yayılmış, çinlilər bu əsəri “Ədəbi”l-mülk” (Ədəbiyyat xəzinəsi), Maçinlər “Aynü”l-məmləkət” (Ölkənin güzgüsü), masrıklar (Ərəblər) isə “Zinetü”l-ümera” (əmirlər ziynəti), iranlılar “Şahnamə-i Türk”, turanlılar “Kutadqu Bilig” bəzilərində isə “Pəndnamə-i Mülük” adlandırırlar.

“Kutadğı Bilig”in təqdiqatçılarından Reşit Rahməti Arat qeyd edir ki, “Yusuf bu əsəri ilə insan həyatının mənasını təhlil və onun cəmiyyət və dövlət içindəki vəzifəsini təyin edən bir fəlsəfə, bir həyat fəlsəfəsi sistemi qurmuşdur.” (1979: 25).

Çinli türkoloq Geng-Şi-Min Maçinin Qaraxanlı sulaləsinə aid oldugunu qeyd edərək gösdərir: “Sultan Mahmud Kaşqarlının “Divanü lüğat-it-türk” adlı kitabında qeyd olunur: “Tavğaç, Maçinin adıdır. Bura Çindən dörd aylıq bir məsafədə yerləşir. “Tavğaçlar” Maçində oturan Türk boyudur. Çin əslində üç hissədən ibarətdir. Birincisi yuxarı Çindir ki, bura şərqdədir və buna Tavğac deyirlər. İkinci orta Çindir, burası “Kitay”dır. Üçüncü aşağı Çindir ki, bura “Barhan” adı verilib və bura Kaşğardadı. Lakin indi “Maçin”

"Tavğaç" deyə tanınılır və Kitay ölkəsinə Çin deyilir. Tavğaç Türklərin bir hissəsi olub bu yerlərdə yerləşirlər. "Tat Tavğaç" kəlməsi də Uyğur deməkdir." (Caferoğlu, 1984: 31).

S. M. Kaşğarlı qeyd edir ki: "Yusuf Has Nacib "Kutadğı Bilig" əsərində irəli sürdüyü fikirlər bugünki dövrümüz üçün öz aktuallığını saxlamaqdadı". (2004: 166)

Yusif Has Nacib ideal insanı təsvir edərək yazır: "Bax, insan doğulur, ölür, ama sözü qalır. İnsanın özü gedər, adı qalar. Ey hakim, ey alim, özünü ölümsüz qalmağını istərsən, işin də sözün də yaxşı olsun"

Əsər Türk-islam tarixində, mədəniyyətində və ədəbiyyatında çox dəyərli bir əsərdir.

**Ədəbiyyat**

1. Taşagıl A. Kök tengrinin çocukları. Bilge Kültür Sanat Yayınevi. İstanbul. 2013
2. Кононов А.Н. Поэма Юсуфа Баласагунского «Благодатьное знание», Москва, 1983
3. Кляшторный С.Г. История Центральной Азии и памятники рунического письма. Санкт-Петербург, 2003
4. Dilaçar A. Kutadgu bilig incelemesi, Türk Dili Kurumu Yayınları. Ankara. 1972.
5. Sultan Mahmut Kaşğarlı. Uyğur türkleri kültürü ve Türk dünyası. İstanbul. 2004.
6. Reşit Rahmeti Arat. Kutadgu bilig. I Metin, II Baskı, TDK, Ankara 1979.
7. Ahmet Caferoğlu. Türk dili tarihi II, İstanbul, 1984

**Rəyçi: dos. D.Hümbətova**

Göndərilib: 25.07.2020 Qəbul edilib: 30.07.2020

DOI: 10.36719/2663-4619/56/51-54

**İradə Fərzəli qızı Rəhmanova**
Bakı Dövlət Universiteti
iraderehmanova@mail.ru

# POSTMODERNİZM ƏDƏBİ CƏRƏYANI VƏ ONUN ÇAĞDAŞ AZƏRBAYCAN ƏDƏBİYYATINDA ÖZÜNÜİFADƏSİ

**Xülasə**

Məqalədə dünya ədəbiyyatında geniş istifadə olunan postmodernizm ədəbi cərəyanı, onun təzahür formaları və bu ədəbi cərəyanın Azərbaycan ədəbiyyatına təsiri haqqında bəhs edilir. Müstəqillik əldə edəndən sonra bir çox yazıçılar Avropa ədəbiyyatının təsiri ilə postomdernist üslubda əsərlər yazmağa başladılar. Bu məqalə həmin əsərlərin nəzəri təhlilinə həsr edilmişdir.

Azərbaycan ədəbiyyatı və mədəniyyəti sahəsində "postmodernizm" anlayışı tənqidçi və yazıçıların müzakirəsi üçün mövzuya çevrildi. Postmodernizm ətrafında müzakirələr bu anlayışın yarandığı vaxtdan bu günədək davam edir. Odur ki, Azərbaycan postmodernizminin əsas xüsusiyyətlətini müəyyənləşdirmək üçün bu istiqamətdə yazılan konkret əsərlərin araşdırılması zəruridir.

***Açar sözlər:*** *postmodernizm, qloballaşma, bədii ədəbiyyat, ədəbi cərəyan, simvolika*

## The literary trend "postmodernizm" and its self-expression in modern Azerbayjani literature

**Summary**

The article deals with such a literary trend as postmodernism and its self-expression in modern Azerbaijani literature. The article contains the review of the different scientists', philosophers' and writers' views related to the postmodernism, forms of its manifestation and its impact on Azerbaijani literature. Many Azerbaijani writers created their works under the influence of European literature in the postmodernist style during the period of independence. Their works are analyzed on the basis of the concrete facts. It is noted that while encompassing a wide variety of approaches, postmodernism is generally defined by an attitude of skepticism, irony, or rejection toward the meta-narratives and ideologies of modernism, often calling into question various assumptions of Enlightenment rationality.

Consequently, common targets of postmodern critique include universalist notions of objective reality, morality, truth, human nature, reason, language, and social progress.

***Keywords:*** *postmodernism, globalization, fiction, literary trend, symbols*

Qloballaşan dünyada baş verən hadisələrin və bununla bağlı çağdaş insanın mənəvi – psixoloji aləmində yaşananların ədəbiyyatda təsirini açıq aydın müşahidə etmək mümkündür. Müasir dövrdə ədəbiyyatda bir – birindən fərqli, orijinal üslublar, cərəyanlar, formalar yaranır ki, bu da bədii sənətdə dialektik inkişaf prosesini açıqca nümayiş etdirir.

Ədəbi – bədii fikrin hər bir mərhələsi, o cümlədən, cərəyan və üslublar konkret estetik hadisə kimi meydana çıxır, özünün poetik sistemi və estetikası ilə reallaşır. Hər bir milli ədəbiyyat kimi Azərbaycan ədəbiyyatı da dünya ədəbiyyatı axarına öz kökləri, tarixi təcrübəsi, estetik bazası ilə qoşulur. Tipoloji yanaşma çox zaman hansısa bir cərəyanın bir xalqa, millətə, coğrafi regiona, milli mədəniyyətə aid lokal hadisə deyil, ümumdünya hadisəsi, bəşəri bir proses kimi dərkinə yol açır. Bu baxımdan XX yüzilliyin sonlarını əhatə edən postmodernizm cərəyanı Avropada, eləcə də Azərbaycan ədəbiyyatında mühüm ədəbi-estetik hadisə kimi dəyərləndirilir.

Postmodernizm XX əsrin sonlarında Avropada inkarı inkar nəticəsində yaranmışdır. Bu cərəyanın təməli modernizmdən qaynaqlanır.

Modernizm klassik, akademik ədəbiyyatı inkar edib yeni bədii formalar yaratdığı kimi postmodernizm (almanca "moderndən sonra gələn") də modernizmi inkar edərək ədəbiyyatda elementlər müxtəlifliyi yaradır.

Postmodernist Amerika yazıçısı Con Bartrın fikrincə, postmodernizm – keçmişin mədəniyyətindən şirə çəkən bədii təcrübədir.

Belə ki, modernizm keçmişi inkar edir, postmodenizm isə keçmişi yadda saxlayıb hadisələri yenidən dəyərləndirir.

Postmodernizm məşhur filosof Jak Derridanın fəlsəfi konsepsiyası əsasında yaranıb. Onun fəlsəfəsinə görə, "dünya mətndir", "mətn obyektiv reallığın yeganə mümkün modelidir". J.F.Liotarın 1979-cu ildə "La

condition postmoderne" adlı əsərində isə postmodernizm "hiper – interpretasiyanın sonu" kimi dəyərləndirilir.

Bəzi düşüncə adamlarına görə post – modernlik post – industrial bir dövr istiqamətində inkişaf edən hərəkatdır. Özü ilə bərabər, modernizmin bir parçası olub-olmadığı, davamlılıq göstərib-göstərmədiyi, yaxud modernizmdən radikal qopma kimi qeyri-müəyyənlikləri ortaya qoyur. Postmodernlik totalitar sistemlərin əvəzinə kütləvi və açıq demokratiya düşüncəsini müdafiə edir.

Postmodernizm heç bir konkret fəlsəfəyə, nəzəriyyəyə itaət etmir. Ağıl və hiss, burjuaziya və marjinalizm, texnologiya və mifologiya postmodernizmdə yan-yana dayanır. Postmodernist üslubda yazılan əsərlərdə gerçək və xəyal gücü bir-birinə qarışır. Gerçəkdən daha gerçək, mistikdən daha mistik hadisələr silsiləsi, yəni hipergerçəklər yaşanır. Postmodernist roman deyiləndə ilk ağlımıza gələn şey dil oyunlarıdır. Bu əsərlərdə dil çoxmənalılıq xarakteri daşıyır. Çünki postmodernist əsərdə mətn içində mətn və ya əlaqəsiz mətnlər toplusu deyə bir quruluş var. Bu da dilin çoxmənalılığını ortaya çıxarır. Həmçinin bu əsərlərdə fraqmentallıq, kollaj daha güclüdür.

Postmodernizmin bir çox əlamətləri var. Bu əlamətlərdən biri və ya bir neçəsi ya da hamısı bir yerdə mövcud ola bilər. Ən önəmlilərindən bir neçəsini sadalayaq: qeyri-müəyyənlik, parçalanma, qaydaların pozulması, ironiya (dünyaya ironik baxış), "mən"in itirilməsi, mələzləşmə (hibridləşmə), karnavallaşma, "mətnpərvərlik", gələcəyə dönüş (back to the future), hər şey gedir (anything goes). Əlamətlərin bəzisini açıqlamağa çalışaq: Qayda-qanunların pozulması Nitsşe ilə başlayıb avtoritarlara lağlağı etməyi ifadə edir. Hər şey gedir (anything goes) ilə izah edilmək istənən məna, postmodernizmdə olmayacaq bir şeyin olmadığı hər cür fikrə və hərəkətə açıq qapı qoyulduğudur. Gələcəyə dönüş (back to the future) anlayışı Maykl Foksun bir filmindən qaynaqlanır. Film zaman maşını ilə həyata keçirilən (gələcəkdə gerçəkləşməsi ümid edilən elmi – fantastika) səyahətlərdən bəhs edir.

Bu əlamətlərə dünya ədəbiyyatında Qabriel Qarsia Markes, Bartr, Bartalim, Pinçon, Umberto Eko, Patrik Züskind, Krüsyan Kraxt, Kristof Rans Mayer, Tomas Brüsik, Qünter Qras, Kristina Volf, Türkiyə ədəbiyyatında Oğuz Atay, Lətifə Təkin, Orxan Pamuk və digər yazıçıların əsərlərində rast gəlmək mümkündür.

Azərbaycan ədəbiyyatında Kamal Abdullanın "Yarımçıq əlyazma", "Unutmağa kimsə yox", Elçin Hüseynbəylinin "Metro vadisi", "On üçüncü həvari", "Yovşan qağayılar", İlqar Fəhminin "Bakı tarixindən kollaj", "Qarğa yuvası", Həmid Herisçinin "Nekroloq" əsərləri postmodern üslubda yazılan romanlardır. Müasir Azərbaycan poeziyasında Adil Mirseyidin, Murad Köhnəqalanın, Qulu Ağsəsin, Qəşəm Nəcəfzadənin, Qismətin yaradıcılığında postmodernizmin əlamətlərinə rast gəlmək mümkündür.

Postmodernizm sadəcə ədəbi-estetik cərəyan yox, həm də dünyaya yeni bir baxış, yaşam tərzidir. Bu cərəyan özündə ədəbiyyatın qloballaşması və mədəniyyətin universallaşmasını ehtiva edir.

XX əsrin Azərbaycan ədəbiyyatı əvvəlki dövrlərdən həm mövzularının, ideyalarının zənginliyi, həm də bədii inikas vasitələrinin polifonizmi ilə fərqlənir.

İ.Bexer yazırdı ki, "Yeni incəsənət heç vaxt yeni formalardan başlamır, həmişə yeni insanla doğulur." Ədəbiyyata gələn yeni nəslin nümayəndələri insanın bədii-estetik dərkində və təqdimində tamam yeni mövqe tutur, bu işdə milli ənənələrlə bir sırada dünya ədəbiyyatının ən yaxşı təcrübələrinə söykənirlər. Və bu əsərlərdə kanonlardan imtina, dəyərlərin yenidən dəyərləndirilməsi faktları üzə çıxır. Məhz bu dövrdə insan problemi bütün problemləri arxada qoyub ön plana keçməyə başladı.

90-cı illərdən sonrakı mərhələ ədəbiyyatda postmodernizm adlandırıldı. Bu da uzun tarixi təcrübədən sonra meydana çıxmış xalqçılıq, türkçülük, azərbaycançılıq, vətənçilik və istiqlalçılıq məfkurəsini müəyyənləşdirdi. Milli şüur və məfkurənin ilkin təzahürü olan ana dilinə Vətən bütövlüyünün, milli varlıq və qeyrət müəyyənliyinin əsası kimi bir çox əsərlər həsr olundu.

Azərbaycan ədəbi mühitində yaşayıb-yaratmış, sənətkarlarımızın bir çoxu cəmiyyətimiz üçün hər zaman vacib sayılan milli birlik, milli özünüdərk problemini azərbaycançılıq, türkçülük kimi mövzularda geniş şəkildə işləyərək vahid ideologiyanın yaranmasına xidmət etmişlər. Anarın "Ağ qoç, qara qoç" və "Dədə Qorqud" əsərləri də bu baxımdan xüsusi maraq doğurur. Görkəmli yazarımız Anar bu əsərlərdə türkçülüyün milli nəsrimizdə nə qədər əbədiyaşar bir irsə malik olduğunu bir daha göstərmişdir. "Ağ qoç, qara qoç" povesti şərti olaraq iki nağıldan ibarətdir. Birinci nağılda azad, xoşbəxt həyat yaşayan Bütöv Azərbaycan, ikinci nağılda isə qara qoçun belindəki parçalanmış Azərbaycandır. Şərqin qədim diyarı olan Bakının təsviri bu əsərdə bütün zənginliyi ilə əks olunmuşdur. Bakını üç zonaya: Behişti – Badi – Kubə, ikinci – Bakı kommunası, Üçüncü – Baku siti zonalarına bölüblər. Adlarından göründüyü kimi fars, rus və ingilis zonalarına bölgü milli şüur və milli mənlik kimi dəyərlərin itməsindən, ana dilinin bəsitləşməsindən xəbər verir. Xalqın bütövlüyünün itməsi, parçalanması təkcə o xalqın, millətin deyil, bütün bəşəriyyətin faciəsidir. Cəmiyyətdə baş qaldırmış böhranlardan, insanların sürətlə təbəqələşməsindən, bərabərliyin pozulmasından

narahatlıq keçirən yazıçı yaratdığı "Ağ qoç, qara qoç" əsərində bu bəlaların səbəblərini göstərir. Yazıçının narahatlığına səbəb olan bu problemlər insanların mənəviyyatına da təsirsiz qalmamışdır.

Arxetiplər və klassik ədəbiyyatın əsasını təşkil edən, Azərbaycan ədəbi fikir tarixində mühüm rol oynamış insan təlimlərinin, fəlsəfi cərəyanların ən başlıcası olan sufilik kodları vasitəsilə şərq aləminin bilicisi kimi çıxış edən Kamal Abdulla "Sehrbazlar dərəsi" adlı əsərində postmodernist mövqedən çıxış edərək milli özünüdərk məsələlərini orataya qoymuşdur.

Postmodernist təfəkkürün bədii və fəlsəfi quruluşunu təşkil edən istiqamət və prinsiplərin təkamülünün xronoloji çərçivəsinin olmaması səbəbindən yazarların qələmə aldıqları əsərlər intuitiv halda ənənəvi dəyərləri kompromissiz olaraq dekonstruksiyaya məruz qoydular. Qeyd etmək istərdim ki, dünya ədəbiyyatında olduğu kimi, Azərbaycan ədəbiyyatında da postmodern üslubda qələmə alınmış ilk əsərlərə reaksiyalar sərt olmuşdur. Postmodern üslubü bu üslubda qələmə alınmış əsərlərə aid janr və struktur yeniliklərini qəbul etməyənlər arasında ədəbi metod, mövqe mübarizəsində mübahisə obyektinə çevrildi. Postmodernizm tərəfdarlarının az olmasına baxmayaraq, bu üslubda qələmə alınmış əsərlərə real qiymət verilərək, ədəbi müstəvidə nəzərdən keçirildilər. Kamal Abdullanın «Yarımçıq əlyazma» romanı oxucu ixtiyarına verildikdən sonra, əsər və müəllif ətrafında baş vermiş müzakirələri buna misal göstərə bilərik. Həmid Herisçinin «Nekroloq» əsərində ənənəvi müəllif təhkiyəsi, süjet və xarakterin aradan qalxması kimi postmodern estetikanın vacib şərtləri özünü göstərir. Azərbaycan ədəbiyyatı və mədəniyyətində «postmodernizm» termini tənqidçi və yazarlar arasında müzakirələrə səbəb olmuşdur. Postmodernizm ətrafında müzakirələr cərəyanın yarandığı ilk gündən başlamış və bu gün də davam etməkdədir. Konkret postmodernist əsərlərin təhlili nəticəsində Azərbaycan postmodernizminin əsas əlamətlərini araşdırmaq, tənqidinin əsas aspektlərini göstərmək zərurətə çevrilmişdir.

Postmodernist ədəbiyyatda metanarrativlərə yer olmadığından qeyri-müəyyənliklər, ikili mənalar, etnik-mədəni dəyərlərin nəzərdən salınması bu estetikanın ana xəttinə çevrilir. Modernist sənətkar özünü kifayət qədər realizə edə bildiyi halda, postmodernizmin subyektiv ətraf aləmin qeyri-şəffaflığını, texnoqrafiya ilə əhatə olunan dünyanın xaotikliyini dərk edən individ daha çox başqalarının bədii kodları ilə manipulyasiya edir. Buna görə də postmodernist sənətkarın geniş təhkiyədən qaçmasını metanarrati və müraciət etdiyi zaman parodiyaya üz tutduğu görünür. Azərbaycan postmodernizminin başlıca xüsusiyyətlərindən biri mifoloji mətnlərdən, motivlərdən, süjetlərdən, obraz və personajlardan yararlanma istəyidir. Mifoloji süjetlərə müraciət Anarın "Ağ qoç, qara qoç", K.Abdullamn "Yarımçıq əlyazma", "Sehrbazlar dərəsi", "Unutmağa kimsə yox" "Kədərli seçmələr" və başqa əsərlərdə nəzərə çarpmaqdadır. Mifoloji qavrayış mistik mahiyyətli olduğundan o, içində keçmişlə gələcək arasındakı münasibətləri qurur, körpü rolunu oynayır. Hər bir milli ədəbiyyatın nüvəsində mifoloji sistem dursa da, müasir dövr ədəbiyyatımızın postmodernist istiqaməti heç də ənənənin müasirliklə sintezindən yaranmır. Əksinə, burada ənənənin aparıcılığına sayğısızlıq nümayiş etdirilir. Postmodernizm elmdən əxlaqa, texnikaya, həyat nizamına, ümumiyyətlə, sənətin bütün sahələrinə uzanan bir həyat baxışıdır. O, özünü rəssamlıqda, memarlıqda, şeirdə, yaşam tərzində, düşüncədə, fikir axınlarında, yazıçının dil-üslub strukturunda büruzə verməkdədir. Amma belə yanaşma romanda daha çox özünü anlatma, söyləmə, ərz etmə şəklində nümayiş etdirməkdədir. Eyni zamanda bu da məlumdur ki, V.Volf, J.Coys, Q.İnfontey, E.Yunq və başqalarına qədər dünyanın yeni dövrdə yazıb-yaratmış yazıçıları bu tərzdən istifadəyə yer vermişlər. Moderndən sonra gələn, onun nəzəri və kulturoloji praktikasından kənarlaşan postmodernizm bir kulturoloji hadisə olaraq bu gün daha çox təkəbbürlə ortada dayanmaqdadır. Burada biz "post" prefiksinə diqqət yetirsək, onun "modern"dən aktiv şəkildə kənarlaşdığını görərik. Eyni zamanda bunu da nəzərdən qaçırmaq olmaz ki, postmodern həm də modernin özünü gücləndirmişdir. Burada digər bir məqam da qeyd olunmalıdır ki, postmodernizm modernizmin iflası, çöküşü və modernizmi inkar edən anlayış kimi də nəzərdən keçirilməlidir. Yurgen Habermasın təbirincə desək, bu "anti-modernizm"dir. Postmodernizmin qavranılması da sırf subyektivdir. Postmodernizm modernizmin heç də bütünlüklə aradan qaldırılması kimi dərk olunmamalıdır. Postmodern modernin bir qədər başqa şəkildə yenilənməsidir. Bu kimi yeni yanaşmalar, dəyərlər anlayışların özünün sistemsizliyinin sistemidir. Məhz belə istiqamətinə görə o, modernizmə yeni rakursdan - onun xaricindən nəzər salma imkanı yaradır. Belə prizmadan baxdıqda postmodernizm heç də sonuna gəlib çıxılmış bir modernizm deyil, o olsa-olsa doğum halında olan bir modernizmdir. Onun təməli Paris Kommunası dövründən gələn bir anlayış kimi XX əsrin 30-cu illərindən ortaya çıxıb, 60-cı illərdən ədəbi dövriyyəyə (Azərbaycanda isə əsrin sonundan) daxil olmuş postmodernizm istənilənin əldə olunması mümkün olmayan modernizmə alternativ olaraq ortaya çıxmışdır. Yuxarıda bildirdiyimiz kimi, postmodernizm məntiqə söykənilləsi hər nə varsa, hamısına qarşıdır. Postmodernizm təfəkkürə və sınanılmış metodlara qarşıdır. Ona istiqamətlənmə və gəlişmə fikri də məhz postmodernizmin təməlini təşkil edir. Elmə görə, inkişaf təkamülə bağlıdırsa, postmodernizm ağılın və texnikanın hər hansı müdaxiləsini tanımır və qəbul etmir. Elm və

texnika insanın təfəkkürünü doğru-dürüst axına salmağa çalışmaqla cəmiyyətin inkişafını konsepsiyalaşmış şəkildə nəzarətdə saxlayırsa, postmodernizm insana həm "bağlı boxça", həm də olduqca "çılpaq" kimi baxır.

Postmodernizmdə ümumilik, homogenlik, determinizm, tərəqqi kimi təqdir ediləcək nə varsa, onların hamısı öz dəyərini itirir və bildirdiyimiz kimi, onların yerini dağılma, fərqlilik, keçicilik, müdaxiləsizlik tutur. Roman sənətində isə konkretliyin yerini görücülük, falçılıq, zahiri gerçəkliyin yerini daxili gerçəklik, obyektivliyin yerini subyektivlik tutur.

## NƏTİCƏ

Postmodernizmdə obyektiv, konkret və dəyişməz bilgilərin yoxluğu ucbatından yolgöstərmənin aydın dərki də mümkün deyil. Çünki postmodernizmdə hər şey başlı-başına buraxılır. Kimlərəsə, nəyəsə, xalqa, millətə, şəxsə hər hansı kəsə əlac edə biləsi bir kəs də ortada deyil (Elçinin "Baş" romanında Sisianov, K.Abdullanın "Yarımçıq əlyazma" romanında Şah İsmayıl Xətainin düşdüyü vəziyyəti yada salaqPostmodern roman, yuxarıda söylədiyimiz kimi, mətnləarasılılığa və mətn içində mətnə (yaxud struktura) malik olur. Qurulmuş mətn - örtülü, yaxud açıq olaraq başqa bir şəklə salınaraq mətn içərisində mətn kimidir. Bu nöqtədə modern roman gerçəklik daxilində olanlarla zənginləşdirilərək anladılarkən düşüncə, fikir axını, geriyə dönüş və s. kimi çeşidli texnikalardan daha çox yararlanır. Modernistlər bunu bir deformasiya kimi dəyərləndirməklə gerçəyi ortaya qoymaq istəyirlərsə, postmodernistlər üçün bu, mətnin onun özünə yönəlməsidir. Başqa sözlə desək, postmodernistlər üçün hekayənin özünü anlatmaq hekayənin özündən daha önəmlidir. Ən başlıcası mətn içində mətn yazıçının yazı texnikasının əsərin içində başqa bir mətndən istifadə etməklə necə yazıldığını anlatması, romanın içərisindəki yazma qaydaları ilə sorğular olub nəzəri məsələlərə də öz bucağından yer verməsidir. Postmodernist yazıçının istəyi mətn içində olub bir dünya yaratmaqdır. Elə buna görə də, o mətn üstündə yaradılmış mətndən üç fərqli şəkildə istifadə edərək oyunsuzluğu saxlamağa çalışır. Bunlar anladıqlarını yetkin fiqur halına gətirib əsərin içinə daxil etmək, mətnin yazılma prosesini, onun əsası olan anlamını göstərmək və əsər yazmanın bir oyun olmasına söykəndiyini və söz oyunlarını ortaya qoymasıdır.

## Ədəbiyyat

1. Bakı Beynəlxalq Humanitar Forumu çərçivəsində “Postmodern dövrdə milli özünüdərk” konfrans materialları, Bakı, Azərbaycan Dillər Universiteti 2013.
2. Əlibəyli B. «Çağdaş tənqid və ədəbi proses: 2004-2007-ci illər». «Körpü» jurnalı, 2008, № 1 və ya 14 may 2007-ci ildə Azərbaycan Yazıçılar Birliyində edilmiş məruzə əsasında hazırlanmış məqalə // 525-ci qəzet.- 2007.- 30 iyun. - № 115.
3. Əlişanoğlu T. Yeni ədəbi nəsil: axtarışlar, problemlər //http: //bizimasr.media-az.com/arxiv_2002/may/113/tengid_romani.html

**Rəyçi: prof.R. Hüseynzadə**

Göndərilib: 10.07.2020 Qəbul edilib: 13.07.2020

DOI: 10.36719/2663-4619/56/55-55

**Aytac Əhmədəli qızı Məmmədova**
Bakı Slavyan Universiteti
1999aytacmemmedova@gmail.com

## ŞƏXS ADLARININ YAZILIŞI
### (tezislər)

Şəxs adları dildə ən fəal, ən çox işlənən söz qrupudur. Ailə-məişətdə, ailə üzvləri arasında, iş yerlərində müraciətlər, əsasən, adlar vasitəsilə ifadə olunur. Buna görə də cəmiyyət daxilində adsızlığa yol verilmir, dünyada adsız insana təsadüf olunmur, pis-yaxşı, hamı ada malikdir.

Yaxşı, gözəl ad hər bir xalqın antroponimik sistemində ad mənəviyyatının əsasını təşkil edir.

Ad probleminə dair məsələlərin öyrənilməsinə Azərbaycan elmində keçən əsrlərdənbaşlanılmışdır. Bu məsələlərə bədii ədəbiyyatda da toxunulduğu müşahidə olunur. Ad probleminin ətraflı və geniş şərhi Azərbaycan elmində, əsasən, XXəsrdə geniş inkişaf tapmışdır.

Bütün xalqlarda şəxs adlarının vəzifəsi cəmiyyət üzvlərini bir-birindən fərqləndirməkdir. Adın vasitəsi ilə insanların birini digərindən seçmək olur. Ona görə də dünyada adsız heç bir şəxs və heç bir cəmiyyət yoxdur. Adlar olmadan cəmiyyətin formalaşması və yaşaması da qeyri-mümkündür. Deməli, ad insan üçün ən zəruridir. Onsuz heç cür ötüşmək olmaz. Ad insana körpəlik çağında bir dəfə verilir. Ad insanı ruhlandırmalı, cəsarətləndirməlidir. Şəxs adlarının bir sıra maraqlı xüsusiyyətləri vardır. Şəxs adlarının əsas xüsusiyyətlərindən biri nitqdə başqa sözlərə nisbətən çox tez-tez işlənməsidir. İctimai yerlərdə, iş prosesində şəxs adları tez-tez səslənir. Hər bir adam ilk görüşdə öz adını söyləyir. İnsan adlarının yaranma tarixi çox qədimdir. Yaranan hər hansı bir ad xalq tərəfindən bəyənildikdə adlar sistemində xüsusi yer tutur və istifadə edilir. Hər söz şəxs adı ola bilərmi? Dilçilik elmində bu suala həm mənfi, həm də müsbət cavablar vardır. Belə ki, bir qrup alim dildəki hər növ sözdən şəxs adı düzəltməyin mümkün olduğunu bildirmişdir. Lakin digər alimlər bu fikrin əksini söyləmişlər. İkinci fikir həqiqətə daha uyğundur. Dilimizdəki sözlərin hamısından yox, müəyyən hissəsindən şəxs adı yaratmaq olur. Hətta eyni anlayışı bildirən iki sözdən biri şəxs adı kimi işlədilir. Dilimizdə ayna və güzgü sözləri eyni məna bildirir. Lakin bunlardan ayna sözü şəxs adının tələblərinə daha çox cavab verdiyi üçün Ayna şəxs adı əmələ gətirilmiş və işlənməkdədir. Təcrübə göstərir ki, düzgün seçilməyən və ya əcayib ad insana pis təsir edir, onu başqalarının yanında utandırır, inkişafına maneçilik törədir. Hətta belə qəribə adlar bəzən onu daşıyanı gülünc hədəfinə çevirə bilir. İnsanın adı ömürlükdür. Hər bir ad aid olduğu şəxsi ömür boyu müşayiət edir. Ad insan dünyasını dəyişdikdə onu yaşadır. Məlum olduğu kimi, Nizami Gəncəvi 12-ci əsrdə yaşayıb-yaratmış, öz yaradıcılığı ilə dünyada böyük ad qazanmışdır. Bu ad onu daima yaşadır. İndi Nizami Gəncəvinin adı vasitəsi ilə mütəfəkkir bir şairi təsəvvürdə canlandırırıq, ondan öyrənir və ona münasibət bildiririk. Dildə mövcüd olan xüsusi adların cəmi onomastikanı təşkil edir. Deməli, onomastika hər hansı bir dildə ki, xüsusi adların məcmusudur. Məsələn, Azərbaycan dilinin onomastikası, Özbək dilinin onomastikası, Türk dilinin onomastikası vəs.

Demək, belə bir qənaətə gəlirik ki, AD şəxsiyyət və mənəviyyətin fərdiliyinin simvoludur.

### Ədəbiyyat

1. Əliyev H. Şəxs adları 1987.
2. Hüseynzadə Ç. Şəxs adları 1988.
3. Paşayev H. Şəxs adları 1998.

**Rəyçi: dos. Ş.Seyidova**

Göndərilib: 01.08.2020 Qəbul edilib: 03.08.2020

## HÜQUQ THE LAW

DOI: 10.36719/2663-4619/56/56-59

**Farid Ziyat Ahmadov**
Baku State University
Feridehmedov-29@mail.ru

# THE MAIN ROLE OF PROSECUTOR OFFICE IN THE FIELD OF INVESTIGATION OF INTERNATIONAL CRIMES INCLUDING JURISDICTION OF İNTERNATIONAL CRIMINAL COURT AND THE MAIN CHARACTER OF COOPERATION AGREEMENT BETWEEN THE INTERPOL AND PROSECUTOR OFFICE

**Summary**

The fight against international crime has been a serious problem for states, especially since the second half of the 20th century. One of the most effective organizations in the fight against this is the International Criminal Court. One of the main bodies of the International Criminal Court is the Prosecutor Office. The article describes the main tasks of Prosecutor Office, the main features of the candidates for this position, the grounds for appointment and dismissal, the main functions of collecting evidence used in the investigation of international crimes and the main features of the cooperation agreement between Interpol and the Prosecutor Office.

***Key words:*** *fight against international crimes, prosecutor office, evidence, investigation of crimes, cooperation agreement*

## Beynəlxalq Cinayət Məhkəməsinin yurisdiksiyasına daxil olan beynəlxalq cinayətlərin istintaqı sahəsində Prokurorluq ofisinin əsas rolu və İnterpol ilə Prokurorluq ofisi arasında əməkdaşlıq sazişinin əsas xarakteristikası

**Xülasə**

Beynələlxalq cinayətkarlıqla mübarizə xüsusilə 20-ci əsrin ikinci yarısından etibarən dövlətlərin ciddi problem hesab edilmişdir. Bu sahə ilə mübarizədə yaradılan ən effektiv təşkilatlardan biri Beynəlxalq cinayət məhkəməsi hesab olunur. Beynəlxalq cinayət məhkəməsinin əsas orqanlarından biri Prokurorluq Ofisidir. Məqalədə Prokurorluq Ofisinin əsas vəzifələri, funksiyaları bu vəzifəyə namizədlərin əsas xüsusiyyətləri, vəzifəyə təyin olunma və azad olunmanın əsasları, beynəlxalq cinayətlərin istintaqında isfifadə olunan sübutların toplanmasında əsas funksiyaları və İnterpolla Prokurorluq Ofisi arasında imzalanan əməkdaşlıq sazişinin əsas xüsusiyyətləri əks olunmuşdur.

***Açar sözlər:*** *beynəlxalq cinayətlərlə mübarizə, prokurorluq ofisi, sübutlar, cinayətlərin istintaqı, əməkdaşlıq sazişi*

## Introduction

Since the second half of the 20th century, the fight against international crime has been one of the main unresolved problems of all countries. If there is a serious fight against international crimes within the framework of international criminal law also, the development of civilizations, interstate relations and, in parallel with the expansion of the exchange of information, the range of various types of international crimes has also expanded, to the detriment of the interests of states has become a real threat in the modern world. In character, according to the degree of danger and the negative consequences not the life of one or more states, but the life of all mankind to prevent acts affecting the interests of to ensure the effective fight against crimes against humanity in international law national legal systems are not enough. The constituent elements of such acts are determined by general international law and the criminal liability of those who committed those acts. Appropriate mechanisms are being established for its implementation. Significant progress has been made in this direction in modern times. Yugoslavia and Rwanda ad hoc international criminal tribunals, the International Criminal Court (ICC), as well as in some countries (Cambodia, Sierra Leone, Kosovo, Lebanon, etc.) "mixed" or "internationalized" tribunals, international judges and judicial bodies with prosecutors were established and started functioning.

In particular, it should be noted that the bodies of the International Criminal Court have taken effective steps in the fight against international crime. The organs of the court is reflected in the 34 article of Rome Statute. One of the organs of this court is Prosecutor Office. İn accordance with 42 article of this statute, the

Office of the Prosecutor shall act independently as a separate organ of the Court. It shall be responsible for receiving referrals and any substantiated information on crimes within the jurisdiction of the Court, for examining them and for conducting investigations and prosecutions before the Court. A member of the Office shall not seek or act on instructions from any external source [1]

It is responsible for examining situations under the jurisdiction of the Court where genocide, crimes against humanity, war crimes and aggression appear to have been committed, and carrying out investigations and prosecutions against the individuals who are allegedly most responsible for those crimes. It is for the first time in history that an international Prosecutor has been given the mandate, by an ever-growing number of States, to independently and impartiality select situations for investigation where atrocity crimes are or have been committed on their territories or by their national jurisdictions.

The office is headed by prosecutor elected by Assembly of state parties. The prosecutor operates in personal and substantive independence of both the court and state parties. It is well known that two tendencies clashed at the Rome Conference. Some states wanted to grant the power to set investigations and prosecutions in motion to states and Security Council and the group of the so called like- minded countries were advocating situation of and independent prosecutor capable of initiating proprio motu investigations and prosecutions. The final result was comprise. First of all, the right to carry out investigations and prosecutions was not left to authorities of the individual states or entrusted to a commission of inquiry or similar bodies. Instead, a prosecutor was investigated. States had only two options: Nuremberg model, whereby prosecutor is an official of the state that has initiated investigation and prosecutions and this therefore designated by that state and remains under its control. The second model is Yugoslavia and Rwanda model, whereby the prosecutor is totally independent body. As an independent and impartial body, The prosecutor was granted the power to investigate and prosecute ex officio. [2, p.5]

One of the main issues mentioned in the article is who can be a prosecutor and what are the characteristics of candidates to become a prosecutor. The Prosecutor shall have full authority over the management and administration of the Office, including the staff, facilities and other resources thereof. The Prosecutor shall be assisted by one or more Deputy Prosecutors, who shall be entitled to carry out any of the acts required of the Prosecutor under this Statute. The Prosecutor and the Deputy Prosecutors shall be of different nationalities. They shall serve on a full-time basis. The Prosecutor and the Deputy Prosecutors shall be persons of high moral character, be highly competent in and have extensive practical experience in the prosecution or trial of criminal cases. They shall have an excellent knowledge of and be fluent in at least one of the working languages of the Court. The Prosecutor shall be elected by secret ballot by an absolute majority of the members of the Assembly of States Parties. The Deputy Prosecutors shall be elected in the same way from a list of candidates provided by the Prosecutor. The Prosecutor shall nominate three candidates for each position of Deputy Prosecutor to be filled. Unless a shorter term is decided upon at the time of their election, the Prosecutor and the Deputy Prosecutors shall hold office for a term of nine yearsand shall not be eligible for reelection. Neither the Prosecutor nor a Deputy Prosecutor shall engage in any activity which is likely to interfere with his or her prosecutorial functions or to affect confidence in his or her independence. They shall not engage in any other occupation of a professional nature. The Presidency may excuse the Prosecutor or a Deputy Prosecutor, at his or her request, from acting in a particular case. Neither the Prosecutor nor a Deputy Prosecutor shall participate in any matter in which their impartiality might reasonably be doubted on any ground. They shall be disqualified from a case in accordance with this paragraph if, inter alia, they have previously been involved in any capacity in that case before the Court or in a related criminal case at the national level involving the person being investigated or prosecuted.

The Prosecutor and shall appoint such qualified staff as may be required to their respective offices. In the case of the Prosecutor, this shall include the appointment of investigators. In the employment of staff, the Prosecutor shall ensure the highest standards of efficiency, competency and integrity, and shall have regard, mutatis mutandis, to the criteria set forth in article 36, paragraph 8. The Prosecutor, a Deputy Prosecutor, shall be removed from office if a decision to this effect is made in accordance with paragraph 2, in cases where that person: 1) Is found to have committed serious misconduct or a serious breach of his or her duties under this Statute, as provided for in the Rules of Procedure and Evidence; or; 2) Is unable to exercise the functions required by this Statute. A decision as to the removal from office of a the Prosecutor or a Deputy Prosecutor under paragraph 1 shall be made by the Assembly of States Parties, by secret ballot: 1) In the case of the Prosecutor, by an absolute majority of the States Parties; 2) In the case of a Deputy Prosecutor, by an absolute majority of the States Parties upon the recommendation of the Prosecutor. [1]

The Rome Statute does not define what it considers and investigations and prosecutions. It indicates, however, that investigations involves an actions that maybe taken with respect to the situation or an individ-

ual while prosecution involves action taken with respect to a specific person, in other words a prosecution is an investigations at a more advanced stage. In accordance with 15 article of this statute, prosecutor may initiate investigations proprio motu that trigger the jurisdiction of court under article 13. The statute accords the prosecutor the power to initiate an investigation and to collect evidence upon his or her interpretation of both the law and the facts. Once commenced, the prosecutor must proceed with investigation and unless there is no reasonable basis to do so. The prosecutor may on behalf of the accused, appeal a decision or the sentence of Trial Chamber on any ground that affects the fairness or reliability of the proceedings or decision. At trial the prosecutor has to present all the facts and evidence relevant to whether there is criminal responsibility under this statute. This encompasses both incriminating and exonerating circumstances. The prosecutor also has extensive disclosure obligations.

In discharging his or her responsibility for the management and administration of the Office of the Prosecutor, the Prosecutor shall put in place regulations to govern the operation of the Office. In preparing or amending these regulations, the Prosecutor shall consult with the Registrar on any matters that may affect the operation of the Registry. Where information is submitted, or where oral or written testimony is received at the seat of the Court, the Prosecutor shall protect the confidentiality of such information and testimony or take any other necessary measures, pursuant to his or her duties under the Statute. The provisions of rules 111 and 112 shall apply, mutatis mutandis, to testimony received by the Prosecutor. When the Prosecutor considers that there is a serious risk that it might not be possible for the testimony to be taken subsequently, he or she may request the Pre-Trial Chamber to take such measures as may be necessary to ensure the efficiency and integrity of the proceedings and, in particular, to appoint a counsel or a judge from the Pre-Trial Chamber to be present during the taking of the testimony in order to protect the rights of the defense. If the testimony is subsequently presented in the proceedings, its admissibility shall be governed, and given such weight as determined by the relevant Chamber. Where a decision under article 15, is taken, the Prosecutor shall promptly ensure that notice is provided, including reasons for his or her decision, in a manner that prevents any danger to the safety, well-being and privacy of those who provided information to him or her under article 15, or the integrity of investigations or proceedings. The notice shall also advise of the possibility of submitting further information regarding the same situation in the light of new facts and evidence. When the Prosecutor intends to seek authorization from the Pre-Trial chamber to initiate an investigation, the Prosecutor shall inform victims, known to him or her or to the Victims and Witnesses Unit, or their legal representatives, unless the Prosecutor decides that doing so would pose a danger to the integrity of the investigation or the life or well-being of victims and witnesses. The Prosecutor may also give notice by general means in order to reach groups of victims if he or she determines in the particular circumstances of the case that such notice could not pose a danger to the integrity and effective conduct of the investigation or to the security and well-being of victims and witnesses. In performing these functions, the Prosecutor may seek the assistance of the Victims and Witnesses Unit as appropriate. A request for authorization by the Prosecutor shall be in writing. The Pre-Trial Chamber, in deciding on the procedure to be followed, may request additional information from the Prosecutor and from any of the victims who have made representations, and, if it considers it appropriate, may hold a hearing. The Pre-Trial Chamber shall issue its decision, including its reasons, as to whether to authorize the commencement of the investigation, with respect to all or any part of the request by the Prosecutor. The Chamber shall give notice of the decision to victims who have made representations. The Pre-Trial Chamber shall decide on the procedure to be followed and may take appropriate measures for the proper conduct of the proceedings. It may hold a hearing. The Pre-Trial Chamber shall examine the Prosecutor's application and any observations submitted by a State that requested a deferral in accordance with article 18, paragraph 2, and shall consider the factors in article 17 in deciding whether to authorize an investigation. The decision and the basis for the decision of the Pre-Trial Chamber shall be communicated as soon as possible to the Prosecutor and to the State that requested a deferral of an investigation. [3, p. 4, 16-18]

The Prosecutor and the defense may agree that an alleged fact, which is contained in the charges, the contents of a document, the expected testimony of a witness or other evidence is not contested and, accordingly, a Chamber may consider such alleged fact as being proven, unless the Chamber is of the opinion that a more complete presentation of the alleged facts is required in the interests of justice, in particular the interests of the victims., the Prosecutor shall, in evaluating the information made available to him or her, analyses the seriousness of the information received. For the purposes of this rule, the Prosecutor may seek additional information from States, organs of the United Nations, intergovernmental and non-governmental organizations, or other reliable sources that he or she deems appropriate, and may receive written or oral testimony at the seat of the Court. The procedure set out in rule 47 shall apply to the receiving of such testimony. [3, p39]

DOI: 10.36719/2663-4619/56/93-95

**Sevinc Mais qızı Nurullayeva**
Bakı Slavyan universiteti
Sevinc.nurullayeva.26@gmail.com

# AZƏRBAYCANDA İBTİDAİ TƏHSİL SƏVİYYƏSİNDƏ UŞAQLARIN OXU VƏ YAZI BACARIQLARININ İNKİŞAFI

**Xülasə**

İnsan oxuma və yazma bacarıqları ilə ətraf aləmi qavrayır; danışma və yazma bacarıqları ilə duyğularını, xəyallarını və təəssüratlarını qarşısındakılara çatdırır. Başqa sözlə desək, dinləmə və oxuma anlama bacarığıdır, danışma və yazma anlatma bacarığıdır. Buna görə də, ibtidai sinif şagirdlərində oxuma, yazma bacarıqlarının inkişafı çox vacibdir. Bu bacarıqlar arasındakı əlaqə yaxşı başa düşülməlidir və bu bacarıqlara təhsil və təlimdə diqqət yetirilməlidir.

***Açar sözlər:*** *İbtidai təhsil, tədqiqatlar, oxuma, yazma, oxu və yazı arasında əlaqə*

## Development of children's reading and writing skills at level of primary education in Azerbaijan

**Summary**

Human beings perceive of the outside world by listening and reading skills; he also conveys his emotions, thoughts, dreams and impressions to his opponents with his speaking and writing skills. In other words, listening and reading comprehension, speaking and writing is the ability to explain. For this, developing reading, writing skills in primary school children is important. The relationship between this skills should be well understood and attention should be paid to these skills in education and training.

***Key words:*** *Primary education, researches, reading, writing, relationship of reading and writing*

## Giriş

Uşaqların oxuma və yazma bacarıqlarını vaxtında öyrənməsi çox vacibdir. Tədqiqatlar göstərmişdir ki, vaxtından gec oxumağı və yazmağı öyrənən uşaqlar gələcəkdə təhsildə bir çox problemlərlə qarşılaşırlar. Təhsilin ilk pilləsi olan ibtidai təhsildə oxumağı və yazmağı heç öyrənə bilməyən və ya zəif öyrənən şagirdlər üçün təhsilin növbəti pilləsi uğursuz keçir. Buna görə də, Ana dili fənni insanın həyatında böyük rol oynayır. Bu fənni öyrənmək insanın özünü, ətraf aləmini, dünyasını öyrənməsi deməkdir. (Nabat Cəfərova. "İbtidai siniflərdə Azərbaycan dili fənninin tədrisi" I hissə Bakı- 2016. Səh.77) Lakin şagirdlər bu fənni birdən-birə öyrənmirlər. Ana dili məzmun xətlərinə bölünür. Ana dili fənninin məzmun xətləri təhsilin bütün pillələri üzrə aşağıdakı kimi təyin edilmişdir:

1) Dinləmə və anlama.
2) Oxu.
3) Yazı.
4) Dil qaydaları. (Nabat Cəfərova. "İbtidai siniflərdə Azərbaycan dili fənninin tədrisi" I hissə Bakı- 2016. səh.90)

Bu bacarıqların hər biri uşaqlar üçün təkcə Ana dili fənnində deyil, Riyaziyyat, Həyat bilgisi, İngilis dili və bunlar kimi bütün fənlərdə onların uğur qazanmağında böyük rol oynayır. Oxu və yazı ana dilinin 2 əsas məzmun xətti olub bir-biri ilə sıx bağlıdır. İnsanların gündəlik həyatlarında istifadə etdikləri sözləri, ifadələri simvollara və işarələrə çevirməsi ilə adlandırması oxuma və yazma bacarıqlarının meydana gəlməsinə səbəb olmuşdur. Başqa insanları aydın şəkildə anlaya bilməyin, özünü dəqiq, doğru və gözəl ifadə etməyin, ətraf aləm haqqında məlumat almağın, cəmiyyətdə fikir bildirməyin və ya fikirlərə rəy bildirməyin yolu oxu və yazı bacarıqlarına mükəmməl yiyələnməkdən keçir. Düzgün və sürətli oxuyan, anlayan və fikir bildirən, özünü şifahi və yazılı olaraq doğru ifadə edə bilən şagirdin təhsilində və həyatında uğur qazanacağı mütləqdir. Belə şagirdlərə həyatımızın hər sahəsində ehtiyac vardır. Uşaqların oxu və yazı bacarıqlarına yiyələnməsində sözlərin səslərdən yarandığını anlaya bilmələri çox vacibdir. Səsləri anlamaq və fərqləndirə bilmək erkən oxu və yazı bacarıqlarına yiyənməkdə əsas rol oynayır. Uşaqlar hərflərin mənasını anladıqdan sonra səslərin mənasını başa düşürlər. Əgər bir uşaq səs və hərf arasındakı fərqi anlaya bilmirsə, o ya oxuya bilməyəcək, ya oxuduğunu anlamaqda çətinlik çəkəcək, ya da heç anlaya bilməyəcəkdir. Oxu və yazı mərhələləri biri-biri ilə sıx bağlıdır. Birini öyrənmək digərini öyrənməkdə böyük rol oynayır.

## İbtidai siniflərdə oxuma bacarıqlarının inkişaf etdirilməsi

Oxu zehnimizdə yeni düşüncələr yaradır, köhnə düşüncələri canlandırır və köhnə düşüncələri yeni düşüncələrlə birləşdirir. Yaxşı oxumaq üçün şagird əvvəlcə hər sözün mənasını anlamalıdır. Yəni, oxuduğu

sözü başa düşməlidir. Çünki, həmin oxunulan söz mənası ilə birlikdə uşağın hafizəsində və göz yaddaşında uzun müddət qalır. Başqa mətnlərdə həmin sözlə rastlaşdıqda sürətli şəkildə oxuyub keçir. Bu, sözü tanımaqdır. Bunu belə izah etmək olar: insan tanımadığı insana necə münasibət göstərəcəyini bilmir lakin tanıdığı insana necə davranacağını çox yaxşı bilir. Lakin oxumaq tanımaqla və anlamaqla kifayətlənmir. Yaxşı oxumaq üçün axıcı oxumaq da vacibdir. Axıcı oxu isə durğu işarələrini şifahi nitqdə düzgün ifadə edə bilməkdir. Yəni, axıcı oxu nöqtə və vergülə uyğun fasilə vermək, sual işarəsi ilə sual bildirmək, nida ilə həyəcanını ifadə edə bilmək və.s deməkdir. Uşaqların oxusunda ən çox rastlanan səhvlər və səbəbləri isə bunlardır:

- **Hərf səhvləri:** əsasən 1-ci sinif şagirdlərində hərf səhvlərinə rast gəlinir. Uşaqlar "b" hərfini "d" kimi, "p" hərfini "q" kimi oxuyur. Ya da "ay" yerinə "ya" oxuyurlar. Bu səhvlər oxumağı və yazmağı yeni öyrənən uşaqlarda baş verir. Bir müddət sonra yox olur. Bunu aradan qaldırmaq üçün aşağıdakı metoddan istifadə edilir. Bu metodla hərflər uşağa oxutdurulur.

p b q d b q
o q b p q d
p o q b d b
q d o q b p

- **Sözü ötürmə:** oxu zamanı sözlərin bir hissəsini və söz birləşmələrini oxumadan keçməkdir. Ötürmə səhvi diqqətsizliklə əlaqədardır. Bu səhvi aradan qaldırmaq üçün uşaqların mətni barmağı ilə izləyərək oxuması faydalıdır.
- **Sözü təkrarlama:** bunun əsas səbəbi söz ehtiyatının az olmağıdır. Təkrarlama şagirdlərin oxuma geriliyinə səbəb olan böyük səhvlərdəndir. Çünki uşaqlar mətndə sözləri çox təkrarladıqda sözü yenidən oxumalı olurlar. Mətnin sonunda uşaq yorulur və mətnin əvvəlində oxuduğu sözlər yadından çıxır. Bu səhvi aradan qaldırmaq üçün sözləri işarələməkdən istifadə olunur.
- **Əlavə etmə:** bu problem də təkrarlama kimi diqqətlə əlaqədardır. Təkrarlama kimi əlavə etmə səhvi də mətnin sonunda şagirdin yorulmağına və mətnin əvvəlindəki sözləri unutmağına səbəb olur. (Oxu təlimi müəllimlər üçün vəsait. Səh.45)

Uşaqların oxuma bacarıqlarını inkişaf etdirmək üçün müxtəlif strategiyalardan istifadə olunur. Bu strategiyalardan ən əsasları təkrar oxuma, exo oxuma, ahənglə oxuma, cüt oxumadır.

**Təkrar oxuma:** bir mətni səlis oxuyanadək təkrar-təkrar oxumaqdır.

**Exo oxuma:** "exo" sözü "əks-səda" deməkdir. Müəllim mətndə bir cümlə oxuyur və arxasıyca şagird həmin cümləni yenidən oxuyur.

**Ahənglə oxuma:** müəllim və şagird mətni bir yerdə oxuyurlar.

**Cüt oxuma:** bu oxumada şagirdin biri zəif oxuyucudursa ona kömək edən yoldaşı mütləq yaxşı oxuyucu olmalıdır. Əvvəlcə kitab seçilir, sonra cüt şagirdlər oxumağa başlayırlar. Əgər zəif oxuyan şagird çətinlik çəkərsə, yoldaşı bu çətinliyi aradan qaldırmağa kömək etməlidir.

(http://ozgulogrenme.akademikadim.com/2018/01/16/okuma-becerisinin-gelistirilmesi/)

**İbtidai siniflərdə yazı bacarıqlarının inkişaf etdirilməsi**

Uşaqlarda ilkin yazı bacarıqlarının yaranmasında onların yazı haqqında təsəvvürləri mühüm rol oynayır. Tədqiqatlar göstərmişdir ki, uşaqlarda yazı haqqında ilkin təsəvvürlər 3 yaşından etibarən başlayır. "Uşaqlar 3 yaşından etibarən ətrafındakı yazıları tanıya bilirlər." (Wortham, 2005) Yazı bacarığı əsas bacarıqlardan biri olub uşaqlara məktəbə getdikləri ilk gündən öyrədilir. Bunun üçün uşaqlar əvvəlcə qələm tutmağı düzgün bilməlidirlər. Psixoloqlar uşaqların qələm tutma bacarıqlarının müxtəlif yaş dövrlərinə bölmüşdür. (https://nellieedge.com/)




Yazı bacarıqlarına yiyələnməkdə əlifba təlimi dövrünü uğurla başa vurmaq çox vacibdir. Əlifba təlimi dövründə uşaq yazıların işarələrdən meydana gəldiyini, işarələrin isə hərf və hərf qruplarında birləşdiyini anlayır, sözlərin hərf və hecalardan meydana gəldiyini başa düşür. Bu dövrdə uşaqların hərfləri tanımağı çox vacibdir.

Bütün dərslərə və çalışmalara baxmayaraq, bəzi uşaqlarda yazı çətinliyi qalır. Nə üçün bəzi uşaqların yazıları zəif olur? Bu sualın cavabı kimi aşağıdakıları göstərmək olar.

- **Qələmi düzgün tuta bilməmək:** buna görə də, müəllim şagirdlərə barmaqlarını məşq etdirmək üçün müxtəlif hərəkətlər etdirməlidir. Bundan başqa şagirdlərin çoxu qələmi sağ əlində tutub yazsa da, bəziləri isə sol əli ilə tuturlar. Sağ beyin yarımkürələrini çox istifadə edənlər hərəkətləri sağ əlləriylə etməyə öyrəşirlər, amma sol beyin yarımkürələrini daha çox istifadə edənlər hərəkətləri sol əli ilə görməyə öyrəşirlər. Bəzi valideynlər sol əli ilə yazan uşaqları sağ əli ilə yazmağa məcbur edirlər. Bu isə düzgün deyildir. Nəticədə, uşağın yazmağında çətinlik yaranır.
- **Uzun müddət yaza yazmamaq.**
- **Kağıza öyrəşə bilməmək.**
- **Düzgün oturmamaq:** uşağın oturduğu masa onun boyuna uyğun olmalıdır. Əgər masa uşağın boyuna görə böyükdürsə və hündürdürsə, uşaqların qolları tez yorulur. Əgər masa uşağın boyuna görə balaca olarsa, boyun və bel əzələləri yorulur. Nəticədə, yaxşı yazı yaza bilmirlər.
- **Fərqli ölçülərdə yazılan hərflər.**
- **Əskik yazılmış hərflər, ötürülən sözlər:** Bu problemə ibtidai siniflərdə bir çox uşaqlarda rast gəlinir. Buna görə də, göz əzələlərinin məşq etdirilməsi üçün tapşırıqlar, fəaliyyətlər, oyunlar və yarışlar təşkil etmək lazımdır. (http://www.dunyaozelegitim.com/yazi-yazma-becerisi)

Yazı bacarıqlarının inkişaf etdirilməsində yerinə yetirilməli bəzi tələblər vardır. Yazının rabitəli olması yazıda əsas şərtlərdəndir. Rabitəli yazıda hərflərin sağa meyilliliyinə fikir verilməlidir. Hərflər eyni ölçüdə yazılmalı və uyğun olaraq bir-birinə düzgün birləşdirilməlidir. Hərflər sətir üzərində düzgün yerləşdirilməli və xüsusi xətdən kənara çıxmamalıdır. Yazı yazarkən yazı sürətli yazılmalıdır. Uzun vaxt ərzində ləng yazılan yazı uşaqların yaddaşında qalmır. Sürətli yazı yazmağı öyrənən şagird gələcəkdə fikirlərini yazıyla daha yaxşı ifadə edə biləcək. Yazı rabitəli və sürətli olduğu kimi aydın və səliqəli olmalıdır. Hərflər çox böyük və çox kiçik yazılmamalıdır. Orta ölçüdə və aydın yazılmalıdır. Yazıda qaralamalara yol verilməməlidir. Bu problem təkcə ibtidai sinif şagirdlərində deyil, orta sinif şagirdlərində də çox rast gəlinir. Yazı aydın və səliqəli olmadıqda oxuna bilmir. Tədqiqatlar göstərmişdir ki, yazı yazma problemləri nəinki ibtidai təhsildə, hətta orta və tam təhsildə də vardır. Gözəl, səliqəli yazmaq hər bir məktəblinin yiyələnməli olduğu əsas bacarıqlardan biridir.

## Ədəbiyyat

1. Nabat Cəfərova. "İbtidai siniflərdə ana dilinin tədrisi metodikası I hissə ". Bakı – 2016
2. Oxu təlimi müəllimlər üçün vəsait pdf
3. http://ozgulogrenme.akademikadim.com/2018/01/16/okuma-becerisinin-gelistirilmesi/
4. "Wortham" journal. 2005
5. https://nellieedge.com/
6. Bonnie Burns. "How to teach balanced reading & writing". California – 2006
7. http://www.dunyaozelegitim.com/yazi-yazma-becerisi

**Rəyçi: dos. Ş.Ağakişiyeva**

Göndərilib: 30.07.2020 Qəbul edilib: 03.08.2020

DOI: 10.36719/2663-4619/56/96-99

**Ruqayyə Sərdar qızı Babayeva**
Bakı Slavyan Universiteti
Babaeffarugayya@gmail.com

# İBTİDAİ SİNFDƏ ƏDƏBİ TƏLƏFFÜZ ÜZRƏ İŞİN TƏŞKİLİ

**Xülasə**

Tələffüz dedikdə, dilimizin ümumi normalarına uyğun danışmaq nəzərdə tutulur. Ədəbi ayrı-ayrı sözlərin, hətta nitq səslərinin tələffüzü qaydalarına əməl olunmasını tələb edir. Bu qaydaların məcmusu orfoepik normalar adlanır. Orfoqrafiya ədəbi dilimizin yazılı qolunu normallaşdırır. Dilimizdə sözlərin bir qisminin tələffüzü ilə yazılışı eynidir: məsələn, ana, səhər, nar və s. Azərbaycan dili orfoepiyasının əsasları I sinifdən etibarən praktik şəkildə öyrədilməlidir. Orfoqrafiq çalışmalar xarakterinə görə müxtəlif olur. N.S.Rojdestvenski onun üç qrupunu göstərir: 1) şagirdlərin dərketmə xarakterinə görə; 2) yerinə yetirilərkən iştirak edən analizatorların xarakterinə görə; 3) dərsin məqsədinə görə. Orfoqrafik qaydanın bu yolla formalaşması onun avtomatlaşmasına səbəb olur.

***Açar sözlər:*** *tələffüz, norma, fərq, nitq, praktika, müəyyənləşdirmək*

## Organization of work on literary pronunciation in primary school

**Summary**

Pronunciation means speaking in accordance with the general norms of our language. Literature requires adherence to the rules of pronunciation of individual words, even speech sounds. The set of these rules is called orthoepic norms. Spelling normalizes the written branch of our literary language. In our language, the pronunciation of some words is the same: for example, mother, morning, pomegranate, and so on. The basics of Azerbaijani orthoepy should be taught in practice from the first grade. Spelling exercises vary in nature. N.S. Rozhdestvensky shows its three groups: 1) due to the perceptual nature of students; 2) due to the nature of the analyzers involved in the implementation; 3) according to the purpose of the lesson. The formation of the spelling rule in this way leads to its automation.

***Key words:*** *Pronunciation, norm, difference, speech, practice, identify*

## Giriş

Ədəbi dilin saflığı onun tələffüz normalarına necə əməl olunmasından da çox asılıdır. Fikrin dinləyiciyə dəqiq çatdırılması, həmçinin eşidilənlərin aydın başa düşülməsi çox vaxt tələffüzün aydınlığı ilə bağlı olur. Geniş mənada tələffüz dedikdə, dilimizin ümumi normalarına uyğun danışmaq nəzərdə tutulur. Bu mənada tələffüz həm ədəbi tələffüzü, dialekt tələffüzünü, məhəlli tələffüzü, həm də adi danışıq tələffüzünü əhatə edir. Bu termin konkretləşdirilmiş, dar mənada " ədəbi tələffüz" şəklində işlənir. Ədəbi tələffüz ədəbi dilin normalarını gözləməklə danışmağı, ayrı-ayrı sözlərin, hətta nitq səslərinin tələffüzü qaydalarına əməl olunmasını tələb edir. Bu qaydaların məcmusu orfoepik normalar adlanır. Orfoepiya ədəbi dilin şifahi qolunu ümumi normalar əsasında formalaşdıran, yəni sövti cəhətdən ümumiləşdirici normaları təzahür etdirən tələffüz qayda – qanunlarının sistemli məcmusudur.

Əlifba təlimi dövründən tədricən şagirdlərə başa salmaq lazımdır ki, nitqdə olan bütün səsləri yazıda eynilə vermək mümkün deyil, çünki bəzən dilimizdəki səslərlə hərflər uyğun gəlmir. Bu səbəbdən də sözləri həmişə yazıldığı kimi tələffüz etmək və tələffüz edildiyi kimi yazmaq olmaz. Sözlərin bir cür tələffüz olunub, başqa cür yazılması heç də orfoqrafiya ilə orfoepiya arasında köklü fərq olduğunu göstərmir. Əksinə, orfoqrafiya və orfoepiya ədəbi dilin bir-biri ilə sıx bağlı olan iki cəhətidir. Orfoepiya və orfoqrafiyanın vəzifəsi nitqin bütün fərqli xüsusiyyətlərini rədd edərək dili daha geniş ünsiyyət vasitəsinə çevirməkdən ibarətdir.

Orfoqrafiya ədəbi dilimizin yazılı qolunu normallaşdırır. Dövlət tərəfindən təsdiq olunmuş, ölçülüb-biçilmiş bu vahid normalar cəmiyyətin bütün üzvləri üçün məcburi hesab olunur. Bu ümumicbari qaydalara riayət edilmədikdə insanlar arasında yazılı ünsiyyət çətinləşir, savadlılıq təmin olunmur. Orfoqrafiya yazılı nitq üçün nədirsə, orfoepiya da şifahi nitq üçün eyni əhəmiyyət kəsb edir. Tələffüz qaydalarının məcmusu olan orfoepiya dilimizin şifahi qolunu şifahi nitqi normalaşdırır. Adətən, şifahi nitqi eşidərkən diqqətimizi onun səs cəhətinə, sözlərin fonetik tərkibinə yönəltmir, bütövlükdə mənanı qavramağa çalışırıq. Rəsmi yığıncaqlarda, radio və televiziya verilişlərində çıxış edənlərin orfoepik normaları gözləməmələri üzündən tələffüzdəki nöqsanlar istər- istəməz diqqətimizi yayındırır, onların tələffüzü xoşagəlməz təsir bağışlayır, bəzən hətta anlaşılmır.

Qarşıya belə bir sual çıxır: " Yazıldığı kimi danışmaq olmazmı?" Belələri orfoqrafiya ilə orfoepiya arasında sərhədi silməklə işi "asanlaşdırmağa" çalışırlar. Yazıldığı kimi oxumaq, danışmaq, başqa sözlə, "orfoqrafik tələffüz", " kitab tələffüzü" tərəfdarları bu zaman tələffüzün nə qədər süni, ağır, gülünc şəkil alacağını nəzərdən qaçırırlar. Bəziləri isə əksinə, tələffüz olunduğu kimi yazmağı, orfoqrafiyanı tələffüzə tabe etməyi məsləhət görürlər. Belələri isə unudurlar ki, yazıda tələffüz əsas götürülərsə, hər kəs yaşadığı dil mühitində alışdığı tələffüzə, dialekt tələffüzünə müvafiq yazar. Beləliklə də, tam dərəbəylik yaranar, savadsızlıq hökm sürər.

Dilimizdə sözlərin bir qisminin tələffüzü ilə yazılışı eynidir: məsələn, ana, səhər, nar və s. Digər qisminin tələffüzü isə yazılışından fərqlənir: məsələn, qəhraman, xoşbaxt, ambar şəklində tələffüz olunan sözlər qəhrəman, xoşbəxt, anbar şəklində yazılır. Şagirdlər belə sözləri tələffüzünə əsasən yazdıqda çoxlu səhvlərə yol verirlər. Bütün bunları nəzərə alaraq ana dili dərslərində Azərbaycan dili orfoepiyasının əsasları I sinifdən etibarən praktik şəkildə öyrədilməli, digər dərslərdə, sinifdənxaric tədbirlərdə şagirdlərin tələffüzünə ciddi nəzarət edilməlidir.

Dilimizin orfoepik normaları çox və rəngarəngdir. Onlardan ibtidai siniflərin hər biri üçün müvafiq olanlarını seçməyi bacarmaq lazımdır. Əvvəlcə şifahi nitqimizdə çox işlənən və tələffüzü nisbətən asan sözlərdən başlanmalı, sonrakı siniflərdə əvvəllər öyrənilənlər təkrarlanmalıdır.

***Şagirdlərdə qrammatik anlayışların formalaşdırılması.***

Qrammatik hadisələr, anlayışlar, canlı dil üzərində müşahidələrdən doğur, insan təfəkkürü bu mücərrəd anlayışları sistemləşdirir, cilalayır, qayda və təriflər yaradır, nitqi düzgün qurmaq məqsədilə tətbiq edir, çünki təcrübə həqiqətin meyarıdır.Yalnız təcrübədə sınaqdan keçirilərkən özünü doğruldan qrammatik anlayış həqiqət olur.

Tədris prosesində şagirdlərin aldıqları biliklər qavrayış və təsəvvürlər çərçivəsində qalmamalı, onların ümumiləşdirilməsi əsasında anlayışlara çevrilməlidir.Əyanilikdən məhrum anlayışların maddi qabığı sözdür.

Hələ savad təliminə yiyələnməmiş şagirdlər sözün səslərdən əmələ gəldiyini və yazıda hərflərlə ifadə olunduğunu bilsələr də, onu öz maddi əsasından, aid olduğu əşyadan ayrılıqda təsəvvür edə bilmirlər.Onlar çox vaxt bu və ya digər sözü onun arxasında duran əşya ilə bərabərləşdirir, onu eyni şey hesab edirlər.Alma sözü, uşağın qarşısında qoyulmuş və həmin sözlə ifadə olunan meyvə (alma) ilə o qədər qırılmaz əlaqədədir ki, onları fikrən bir-birindən ayırmaq üçün təfəkkür yüksək səviyyəyə qalxmalıdır.

Bu dövrdə uşağın gündəlik nitq praktikasının sözün məna cəhəti (leksik cəhət) həlledici rol oynadığından şagird diqqətini məzmunun düzgün verilməsinə yönəldir, lakin diqqəti sözün qrammatik cəhətinə də yönəltmək zəruridir.Şagird II sinifdən başa düşməlidir ki, məsələn, alma sözü yalnız meyvə deyil, həm də qrammatik məna daşıyır (isimdir, cümlədə mübtədadır və s).Müəllim almanı göstərib, şagirdləri başa salır ki, bu əşyadır.Onun adı alma sözüdür.Almanı biz görürük, onu əlimizə alırıq, başqa yerə qoyuruq, iyləyirik, yeyirik.Alma sözü isə səslərdən ibarətdir.Biz onu deyirik, eşidirik, oxuyuruq və ya müvafiq hərflərlə yazırıq.Mən alma sözünü deyəndə sizin yadınıza alma düşür.

Sözlə əşya arasındakı fərqi daha aydın başa salmaq üçün müəllim cürbəcür almalar göstərir və onların hamısını bir sözlə adlandırmağın mümkün olduğunu göstərir.Tədricən şagirdlər hər bir sözün üzərində xüsusi müşahidə aparır, onları mücərrədləşdirməyə başlayır, öyrənirlər.

Şagirdlərin isim, sifət, fel haqqında anlayışlara yiyələnmələri üçün sözlərin qrammatik mənalarının fərqləndirilməsi və sualların verilməsi üzrə məşqlər təşkil edilməlidir.Bu zaman şagirdlər tədricən sözün digər mühüm xassələri ilə də tanış olurlar.Şagirdlər müxtəlif sözləri müqayisə etməklə öyrənirlər ki, onların bir qismi əşyanı, ikinci qismi əşyaların necəliyini (keyfiyyət və əlamətini), üçüncü qismi əşyaların hərəkətini bildirir.

"Nitq hissələri" anlayışı bir neçə il ərzində tədricən mənimsənilir. Şagirdlər əşya, keyfiyyət, əlamət, hərəkət anlayışlarını daha aydın dərk edirlər.

Qrammatik hadisələr arasında əlaqələrin müəyyənləşdirilməsi və qrammatik anlayışların formalaşdırılmasında müqayisə priyomu mühüm əhəmiyyət kəsb edir. İsmin hallanması felin zamana və şəxsə görə dəyişməsi tutuşdurularkən yaranan sözlərarası assosiasiya dərketməni asanlaşdırır.

Tərifin aydın başa düşülməsi onun nitq praktikasında şüurlu tətbiqini təmin edir.Qrammatik anlayışların mənimsənilməsi də məhz şagirdlərin onu ayrı-ayrı hallara aid etmələri, orjinal misallar tapmaları, onların düzgünlüyünü sübut etmələri, gündəlik nitqdə işlətmələri ilə tətbiq olunur.

***Orfoqrafiq çalışmaların ümumi xarakteri.*** Şagirdlər hər bir qaydanı yazı prosesindəki rast gəldikləri müxtəlif hallara tətbiq etməyi bacarmalıdır. Əvvəllər qaydaya aid sözləri müəllim seçir, şagirdlər isə o sözə nə üçün həmin qaydanı tətbiq etmənin mümkünlüyünü aydınlaşdırırlar.Sonralar şagirdlərin özləri qaydanı deyir və cümlədən ona uyğun halları tapır, eynicinsli, bənzər hallarla müqayisə edir, qaydanı dəqiqləşdirir,

ümumiləşdirmə aparırlar. Beləliklə, şagirdlər qaydanı tez və dəqiq tətbiq etməyi öyrənirlər. Orfoqrafik qaydanın bu yolla formalaşması onun avtomatlaşmasına səbəb olur.

Orfoqrafiq çalışmalar xarakterinə görə müxtəlif olur. N.S.Rojdestvenski onun üç qrupunu göstərir: 1) şagirdlərin dərketmə xarakterinə görə; 2) yerinə yetirilərkən iştirak edən analizatorların xarakterinə görə; 3) dərsin məqsədinə görə.

Şagirdlərin dərketmə fəaliyyətinin xarakterinə görə çalışmalar üç qrupa ayrılır: analitik, sintetik, analitik-sintetik (təhlil-tərkib).

a) Analitik çalışmalar. Analitik çalışmalar dedikdə, ofroqrafiyanın asan və möhkəm mənimsənilməsi üçün qrammatik-orfoqrafiq təhlilə geniş yer verilən çalışmalar nəzərdə tutulur. Orfoqrafiq təhlil, üzündənköçürmə və seçmə imla (şagird lazımi orfoqramlı sözləri seçib yazır), xəbərdarlıqlı və izahlı imlalar belə çalışmalardır.

b) Sintetik (tərkibi) çalışmalar. Yoxlama və sərbəst üzündən köçürmə, suallara cavab, yaradıcı və yoxlama imla, ifadə və inşalar belə çalışmalardır. Tərkibi çalışmalarınköməyi ilə şagirdlər əvvəllər öyrəndikləri qaydalar üzrə məşq aparır, həmin qaydaları bir mövzu ətrafında birləşdirirlər.

c) Təhlil-tərkib çalışmaları. Sübut etməklə müşayiət olunan qrammatik-orfoqrafiq təhlil, qrammatik-orfoqrafiq tapşırıqlı cümlə tərkibi, üzündənköçürmə, imla, ifadə və inşa yazıb lazımi orfoqramın altından xətt çəkmək, əşya şəkillərinin altında adlarını yazmaq, mətndə buraxılmış sözləri, sözlərdə buraxılmış hərfləri yerinə qoymaq, tutuşdurma və təsnifdən istifadə etmək və s. belə çalışmalardır.

Həm təhlil, həm də tərkibin elementlərini birləşdirən belə çalışmalar əlverişlidir. Üzündənköçürmə və ya imla yazıldıqdan sonra lazımi orfoqramların altından xətt çəkilirsə, şagirdlərə əvvəlcə tərkib, sonra isə təhlil əməliyyatını yerinə yetirmiş olurlar.

Yerinə yetirilərkən iştirak edən analizatorların xarakterinə görə çalışmaları dörd qrupa ayırmaq olar:

a) görmə qavrayışına əsaslanan çalışmalar (üzündənköçürmə, qismən görmə imla və s.);

b) eşitmə qavrayışına əsaslanan çalışmalar (şifahi orfoqrafiq çalışmalar, imlalar);

c) kinestetik qavrayışa əsaslanan çalışmalar (sözlərin hecalara ayrılması, yazılacaq sözlərin şagirdlər tərəfindən alçaqdan yazıldığı kimi, hecalarla deyilməsi);

ç) müxtəlif təsəvvürlərə əsaslanan çalışmalar (sərbəst yaradıcı imla, suallara cavab, orfoqrafiq tapşırıqlar, ifadə və inşalar və s.);

Dərsin məqsədlərindən asılı olaraq orfoqrafiq çalışmaların aşağıdakı növləri var:

a) sorğu prosesində istifadə olunan çalışmalar; şagirdlər əvvəlcədən təhlil olunmuş cümləni yazı taxtasına və ya dəftərə yazır, sonra bu və ya digər orfoqramın nə üçün belə yazıldığını izah edirlər.Bu, keçilmiş materialın möhkəmlənməsini təmin edir.

b) çalışmaların bir qismi yeni materialın mənimsənilməsinə xidmət edir.Yeni materialın izahı prosesində yazı taxtasında və ya dəftərdə keçilən qrammatik-orfoqrafik qaydaya aid misallar yazılır.Sonra onlara əsasən nəticə çıxarılır, qayda formalaşır.Şagirdlər həmin sözləri cümlədə işlədirlər

c) elə çalışmalar da var ki, ev tapşırıqları ilə əlaqədardır. Ev tapşırıqlarını dərslikdəki bu və ya digər çalışmanın yerinə yetirilməsi ilə məhdudlaşdırmadan yaradıcı işlərlə əlaqələndirmək lazımdır.

## Nəticə

Orfoepiya və orfoqrafiya anlayışlarının mənimsənilməsi çətin prosesdir. Kiçik yaşlı uşaqlardan əksəriyyəti sözün yazılış qaydası ilə deyiliş qaydasını ayırd etməkdə çətinlik çəkir. Bəzi şagirdlər isə sözləri dediyi kimi tələffüz edir. Hər dərs keçdikcə yeni sözlərin, tələffüzü çətin olan sözlərin müəllim tərəfindən təkrarlanması şagirdlərdə düzgün tələffüz qaydalarının formalaşmasına səbəb olur. Eyni zamanda üzündən dəfələrlə oxu nəticəsində də şagird sözü doğru tələffüz etməyə başlayır. I və II siniflərdə bu cür çətinliklərin olması normaldır. Lakin sonradan şagird artıq sözün necə tələffüz olunduğunu və yazıldığını müəyyən etməlidir. Ev tapşırığında səhvlərin tapılması, imla, inşa, ifadə yazı zamanı şagirdin etdiyi səhvlərin aşkara çıxarılması daha vacib məqamlardan biridir. Çünki şagird bu səhvləri görür və göz yaddaşına yazır, eyni zamanda müəllim nədə səhv etdiyini deyib, düzgün formanı ona başa saldıqda artıq sözün tələffüz qaydasının necə olduğunu mənimsəyir və daha sonra bu cür səhvləri etməməyə çalışır.

## Ədəbiyyat

1. Abdullayev A.S. İbtidai məktəbdə Azərbaycan dilinin tədrisinin metodikası. Bakı: Maarif, 1962, 165 s.
2. Abdullayev A.S. Orta məktəbdə Azərbaycan dilinin tədrisi metodikası. Bakı: Maarif, 1968, 262 s.
3. Abdullayev N.Ə. Ədəbi tələffüz təliminin metodikası. Bakı: Maarif, 1986, 162 s.
4. Balıyev H.B. Ana dilinin tədrisi metodikası. Bakı: 3№li Sənaye Liseyi, 1997,102s.
5. Balıyev H.B. Orta məktəbdə Azərbaycan dilinin tədrisi metodikası. Bakı: ADPU-nun nəşri, 2003, 426 s.

6. Həsənov M.,Cəfərova N. İbtidai siniflərdə Azərbaycan dilinin tədrisi metodikası. Bakı: Elm və təhsil, 2013, 404 s.
7. Kərimov Y.Ş. Ana dilinin tədrisi metodikası. Bakı: Nasir, 2003, 520 s.
8. Rəhimov A.N. Ana dilinin tədrisi metodikası. Bakı, 2003, 408 s.

**Rəyçi: dos.D.Hümbətova**

Göndərilib: 30.07.2020 Qəbul edilib: 02.08.2020

## JURNALIN İÇİNDƏKİLƏR:

### TARİX    HISTORY



### FİLOLOGİYA    PHILOLOGY



### HÜQUQ    THE LAW



### PSİXOLOGİYA    PSYCHOLOGY



### PEDAQOGİKA    PEDAGOGY

# "ELMİ İŞ"

**humanitar və ictimai elmlər üzrə aylıq beynəlxalq elmi jurnal**

Jurnalda aşağıdakı sahələr üzrə məqalələr dərc edilir:
- Tarix və antropologiya
- Filologiya
- Hüquq elmləri
- Fəlsəfə və sosiologiya
- Siyasi elmlər
- Psixologiya
- Pedaqogika
- Sənətşünaslıq və memarlıq

Məqalələr Azərbaycan, ingilis, türk və rus dillərində qəbul olunur.

**Jurnalda məqalələrin dərc olunması ödənişlidir**

**Məqalələrin texniki tərtibatına dair tələblər**

**Məqalələrin həcmi:** 8-25 səhifə
- Məqalələr A4 formatda 14 ölçüdə, 1.5 sətirlərarası intervalla, Times New Roman şrifti ilə yazılmalı, kənarlardan 2 sm (hər tərəfdən) boşluq buraxılmalıdır.
- Məqalədə müəllifin adı, atasının adı və soyadı (məs.: Əli Məmməd oğlu Vəliyev), iş yeri (tam şəkildə), ölkə və şəhər, müəllifin şəxsi elektron ünvanı və telefon nömrəsi (məqalənin başlığından əvvəl sağ tərəfdə) göstərilməlidir.
- Məqalədə **Giriş** və **Nəticə** hissələri yazılmalıdır
- Məqalənin əvvəlində məqalənin yazıldığı dildə və ingilis dilində 7-8 cümədən ibarət **Xülasə** və **açar sözlər** (5 sözdən az olmayaraq) yazılmalıdır. Əgər məqalə ingilis dilindədirsə, o zaman xülasə və açar sözlər ingilis və Azərbaycan dilində yazılmalıdır.
- Məqalənin sonunda **Ədəbiyyat** yazılaraq məqalədə istifadə olunan ədəbiyyatın siyahısı verilməlidir. Siyahıda əsərlərin ardıcıllığı istinad ardıcıllığına uyğun verilməlidir.
- **İstinadlar** mətnin içərisində aşağıdakı qaydada yazılmalıdır:

Mətndə mənbənin (fikrin) müəllifi göstərilmədikdə

Müəllifin soyadı - vergül - interval, mənbənin nəşr ili - iki nöqtə - interval - səh. ***Nümunə***: Axundov, 2005: 201)

Əgər müəllifin adı mətndə çəkilirsə o zaman bu qaydada yazılmalıdır: "...A.Axundov (2005: 205) qeyd etmişdir ki..."

**Redaksiya ünvanı:** Bakı ş., Mətbuat pros., 529,
"Azərbaycan" Nəşriyyatı, 6-cı mərtəbə.
www.aem.az saytında məqalələr onlayn yerləşdirilir.
E-mail: elmmerkezi@gmail.com
Tel.: +994 (012) 510 63 99
+994 (050) 209 59 68
+994 (055) 209 59 68

